# Mündəricat

# İBRƏT GÜZGÜSÜ

## KİTAB HAQQINDA


Kitabın adı:..İbrət güzgüsü

Toplayan:.Məlahət Əsədova

Nəşr edən:Faiz

Çap tarixi:.....۲۰۰۷

Çap növbəsi:.....Birinci

Tiraj:.۳۰۰۰

ISBN:....۹۷۸-۹۶۴-۸۹۳۴-۴۳-۴

səh:۱


## İşarə

## ÖN SÖZ

Biz insanlar–hər birimiz müxtəlif yönlərdən yaşa-dığımız topluma sıx bağlıyıq. Həmçinin, bu günkü cə-miyyətimiz zəncirvari bir silsilə ilə yer üzündə yaşa-mış xalqlarla ayrılmaz bir bağlılığa malikdir. Bəşərin ictimai bağlılığı bir tərəfdən, tarixi bağlı-lığı digər tərəfdən insan həyatına xüsusi rövnəq verib onun qarşısında müəyyən .məs`uliyyətlər qoyur

Qur`an hər yerdə insana ictimai bir mövcud olaraq xitab edir, onun vəzifəsini bu xüsusiyyətinə əsasən müəy-yənləşdirir. İctimai bağlılığın möhkəm və ayrılmaz olduğunu bəyan edən ilahi ayələr daha irəli gedərək bütün mö`minləri qardaş və bir ailənin üzvü hesab edir; insa-niyyət dünyası üçün olduqca gözəl və dərin olan bu şüarı (seçir: “Həqiqətən mö`minlər qardaşdırlar.”(١)

İnsanın kamillik yolu yaşadığı toplumdakı digər insanlarla münasibətdən çox asılıdır. .Qur`an bu həqi-qəti qaçılmaz ilahi qanunlar sırasında qeyd edir

Təbiət aləmində Allahın qoyduğu qanunlardan biri də insanların tarix boyu etdikləri əməllərinin sonda–yaxşı və ya pis olmasından asılı olmayaraq özlərinə qayıdacağı qanunudur. Dünyada heç bir əməl əks tə`sirsiz qalmır. Fiziki qanunlarda da belədir: .Hər tə`sir əks tə`sirə malikdir



---

.Hucurat”, ١٠“ [١]-١

:Mövlana Cəlaləddin Rumi demişkən

,Cahan sanki dağ, əməllər haray

.Əks-sədasıyla hərə alır pay

,Pislik edən kəs, bilsin ki, yəqin

.Əkilən hər toxum cücərir bir gün

Mövlana insan əməlini səsin doğurduğu əks-sədaya bənzətmişdir. İnsan gec-tez öz əməllərinin bəhrəsini həm dünyada, həm də axirətdə dadacaqdır. Atalar məsəlində də ".deyilir: "Nə tökərsən aşına, o da çıxar qaşığına

Şübhəsiz, hər günah iş, ictimai quruluşa zidd hərəkətlər istər-istəməz insanların həyatında öz acı bəhrələri ilə təzahür edir. Zəhərli bir yemək insanın bədən sisteminə öz təbii mənfi tə`sirini göstərdiyi kimi, günah iş də öz təbii tə`sirlərilə insanı müxtəlif :ictimai və fərdi problemlərə düçar edir. Misal üçün

.Yalanın tə`siri ilə yalançının xalq arasındakı e`timadı aradan gedir

.Əmanətə xəyanətin tə`siri ilə xəyanətkarın ictimai əlaqələri zəifləyir

.Xalqa zülmün tə`siri nəticəsində ictimai üsyan baş qaldırır

.Fəsad işlərin çoxalması nəticəsində yerin, göyün bərəkəti azalır

.Sileyi-rəhmin kəsilməsi ilə insanın ömrü qısalır

.Haram mal yeməyin tə`siri ilə qəlbi qəsavət bürüyür və haqq söz ona tə`sir etmir

Zinanın doğurduğu tə`sir təbii bəlaların–zəlzələnin, selin çoxalmasına gətirib çıxarır; .həmçinin insanın ruzisinin azalmasına səbəb olur

Xülasə, hər xilaf iş–istər böyük olsun, istərsə də kiçik–xoşagəlməz əks-əməllərlə .nəticələnir

Qur`an buyurur ki, dünyada baş verən bütün müsibətlər, pisliklər insanların öz

dünyalarını və axirətlərini abad, bərəkətli görmək istəyirlərsə, gərək günah işlərdən əl :çəksinlər

Əgər o məmləkətlərin əhalisi iman gətirib (pis əməllərdən) çəkinsəydilər, sözsüz ki,“ (onların baş-larına göydən və yerdən bərəkət yağdırardıq...”(١)

Yer üzünün (qədim) sakinlərindən sonra ona varis olanlara (onların yerinə gələnlərə)“ aydın olmadımı ki, əgər Biz istəsəydik, onları da günahlarına görə müsibətlərə düçar edər, ürəklərini möhürləyərdik (düşüncə və təfəkkür qabiliyyətindən məhrum edər- (dik) və onlar da (öyüd-nəsihət) eşitməzdilər?”(٢)

Maraqlı bir nöqtə budur ki, Allah-təala günahın qarşılığı olaraq insanı düçar etmək istədiyi müsibətlər sırasında “ürəklərin möhürlənməsi”ni göstərir. Bundan da böyük bədbəxtlik nə ola bilər ki, insan düşüncə və təfəkkür qabiliyyətindən məhrum olsun? İnsanın izzəti, şərəfi, insaniyyəti, digər canlılardan üstünlüyü onun şüuruna görədir. Bə`zən insanlar zahiri firavanlıq içərisində yaşayır, özlərini xoşbəxt sanırlar. Halbuki düşüncədən məhrum olduqları, bəla ilə üzləşdikləri halda narahat deyillər. Onlar Allahı unutmuşlar, Allah da onları unutmuş, özbaşına buraxmışdır. Görən ətrafında baş verənlərə biganə, laqeyid, düşüncəsiz harın insan “mən də insanam”–deyəndə nəyi ?nəzərdə tutur

Qur`anda gələcək nəsillərə ibrət olsun deyə keçmişdəkilərin həyatından əhvalatlar nəql edilir. İlk baxışda adi nağıla oxşayan bu əhvalatlar Allahın bə`zən təkrar-təkrar bəyan etməsi insanda sual doğurur: Qur`an bununla insanlara nə demək istəyir? İlahi ?kitab bu əhvalatlara niyə bu qədər yer ayırmışdır

Bilməliyik ki, Qur`anın ayələri külli mə`na daşıyıb ümumiyyət təşkil edir. Qur`an ,ayələri öncə yaşamış tayfaların



---

١- [٢] “Ə`raf”, ٩۶.

٢- [٣] “Ən`am”, ١٠٠.

xalqların hekayəsini nəql etsə də, ayədəki mə`nalar həm də sonra gələcək nəsillərə şamil olur. Daim hərəkətdə olan günəş müəyyən məkan və zamana aid olmadan onunla üzbəüzdə duran planeti işıqlandırdığı kimi, Qur`an da hər zaman və məkanda onunla qarşılaşan kəsə hökm və nur verir. Bu minvalla hər dövranda Qur`an öz hökmünü gələn nəsillərə şamil edir. Bu mə`nada Qur`anda göstərilən əhvalatlarda bəyan edilən hər bir peyğəmbərin və ümmətin şərhi-halı təkcə o dövrü əhatə etməyib, .həm də öncəki və sonra gələcək insanların tək-təkinə aid edilməkdədir

Bu əhvalatlar həqiqətdə bizim öz əməllərimizdən, əqidələrimizdən, xüsusiyyətlərimizdən çıxarılmış ümumi nəticələrdir. Yə`ni bütün cəhətlərdən bizə oxşayan, öncə gəlib getmiş xalqların həyatından götürülmüş və əhvalat formasında verilmiş ibrətlərdir. Biz bu hekayələri oxumaqla onların zəif nöqtələrini, üzləşdikləri müsibətlərin səbəblərini ibrət güzgüsündə görüb bununla öz nəfsimizdən agah olur, onun islahına çalışırıq. Həmçinin öncəki insanların həyatdakı müvəffəqiyyətlərinin səbəbini, yaxşı əməllərinin hansı bəhrələrlə müşahidə edildiyini görəndə, həmin cəhətləri özümüzdə gücləndirmək və ya yaratmaq istəyirik. Başqa sözlə desək, bizim nəfsimizdə “Fir`on” da var, “Musa” da, “İbrahim” də var, “Nəmrud”da, həmçinin “Adəm”, “Habil və Qabil”, “Səmud qövmü və Saleh”, “Ad qövmü və Hud”, nəhayət .“Məhəmməd və müşriklər” də bizim nəfsimizdə yer almışlar

Biz, Musa və Bəni-İsrailin əhvalatlarını oxuyanda, Bəni-İsrailin süstlüyünü, yersiz iradlarını, buzova sitayiş etmələrini, tez bir zamanda yoldan azmalarını görürük. Bilməliyik ki, həmin cəhətlər–süstlük, irad tutmaq, nəfs istəklərinə meyl, yoldan azmaq bizdə də var. Əgər bizlərdən hər birimiz bir anlıq Allahdan qafil olsaq, həmin anda, Bəni-İsrail qövmü buzova tapındığı kimi də dünya cah-cəlalına üz tutur, yolumuzu itiririk. Onlar hansı bəla ilə üzləşmişlərsə, həmin bəla bizim də

sorağımıza gəlir. Əgər Musa kimi imanımızda sabit və dayanıqlı olsaq, biz də xalis .insanlardan olarıq

Qur`anın bu dəyişməz qanunları bütün dövrlərdə eyni hökmlə çıxış etməkdədir. Əgər bir anlığa keçmişimizə nəzər salsaq, hətta azacıq ayıq olub ətrafımızda baş verənlərə diqqət yetirsək, indinin özündə də “fironları” və “musaları” aydın görə bilərik. Tarixin səhifələ-rində dediklərimizi təsdiqləyəcək kifayət qədər maraqlı faktlar mövcuddur. Hazırkı kitabda çox sadə üsulla–insanların öz əməllərinin tə`siri ilə üzləşdikləri hadisələr əməl və əks-əməllər qanunu çərçivəsində əks etdirilmişdir. Əslində bizim hər .birimizin həyatında özümüzə və başqalarına ibrət olacaq belə hadisələr çoxdur

Ümidvarıq hər kəs, xüsusilə də gənclərimiz qəlb-lərinin gözlərini saflaşdırıb heç vaxt qubar götür-məyən bu güzgüyə baxmaqla həyatın ibrət dolu çalarla-rından rəng .alacaq, öz zahir və batinlərini zinətlən-dirəcəklər

Naşirdən

## VALİDEYNƏ MÜNASİBƏT HAQQINDA

### VALİDEYNƏ İTAƏT

Rəbibn yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi (onlara yaxşı gözlə “ baxıb gözəl davranmağı) buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında (yaşayıb) qocalığın ən düşkün çağına yetərsə, onlara: “Uf!” belə demə, üst-lərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış. Onların hər ikisinə acıyaraq mərhəmət qanadının altına alıb “Ey Rəbbim! Onlar məni körpəliyimdən (nəvazişlə) tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et!”–de. Rəbibniz ürək-lərinizdə olanları (qəlblərinizin sirrini) ən yaxşı biləndir. Əgər əməlisaleh olsanız (ata-ananıza bilmədən etdiyiniz pislikdən peşman olub tövbə etsəniz və bundan sonra onlarla yaxşı dav-(ransanız (bilin ki,) Rəbibniz, həqiqətən, tövbə-karları bağışlayandır!”(١)

Bu ayələrdə Qur`an xüsusi tapşırıq verir: Övlad öz valideynləri ilə son dərəcə ehtiram və ədəblə davranmalıdır. Onların bütün ehtiyaclarını gözəl şəkildə yerinə yetirməlidir. Övlad öz ata-anasının qarşısında təvazökarlıq göstərməlidir. Üstəlik, onun bu təvazökarlığı icbar və ya məsləhət üzündən olmamalıdır; sidq ürəkdən onlarla mehri-ban davranmalı, onların hər hansı xoşagəlməz hərəkətlərinə, (qocalığın ixtiyar çağında bə`zi insanların hərəkətləri dözülməz olur) zəhmət-lərinə səbir etməlidir. Onlara dua .edib Allahdan rəhmət diləməlidir



---

.İsra”, ٢٣, ٢٥“ [۴] -١

Bu ayələrdə Allah-təala insana valideynlərə hörmət etməyi ən ali əməli tapşırıq olaraq tə`yin edir. Valideynlə hörmətlə davranmaq insanın şər`i vəzifəsi olmaqla yanaşı həm də onun kamilliyi yolunda öz nəfsi ilə mücahidə aparması kimi də qiymətləndirilir. Yüksək irfani məqamlara yetmək istəyən şəxslər üçün bu, xüsusi bir tapşırıqdır. Şagirdlərindən biri Əllamə Təbatəbaidən ir-fanın nə olduğunu soruşub xüsusi tapşırıq verməsini xahiş edəndə ona bu tövsiyəni etdi: "Çalış ailənlə xoş davran, bütün irfan ".budur

İnsan qoca valideynlərinin verdikləri zəhmətlərə qatlaşmaqla nəfsi çirkinliklərdən paklanır; həyatın ağrı-acısına səbir etməklə dünya və axirət savabına çatır; ruhunda bir yüksəliş hiss edir. Ata-anası övladından razı qaldıqda onun haqqında xeyir-dua edir və dualar əlbəttə ki, səmərəsiz qalmır. Bə`zən zəif bir qocanın səmimi qəlblə etdiyi .dua daha tez müstəcab olur

Belə deyirlər ki, məşhur Bakı milyonçusu Hacı Zeynalabdin Tağıyevin həyatındakı əsaslı dönüşün ilk təkanverici nöqtəsi atasının onun haqqında etdiyi xeyir-duası olmuşdur: Böyük bir ailəyə başçılıq edən Tağıyev (Zeynalabdinin atası) xəstələnib yatağa düşür və işə çıxa bilmir. Ailədə balaca Zeynalabdindən başqa kişi xeylağı olmadığı üçün ata Tağıyevin son ümidi Zeynalabdinə qalır. Zeynalabdin atasına ürək-dirək verib onu narahat olmağa qoymur. O gündən işə atasının yerinə Zeynalabdin .gedir

Ağır inşaat işləri böyük fiziki güc tələb etməsinə baxmayaraq, Zeynalabdin işin öhdəsindən gəlir. İlk qazancını evə gətirən Zeynalabdin axşam süfrə başında

əyləşərkən atası onun qabarlı əllərini görüb bir anlığa qəlbi sınır, kövrəlir; əllərini göyə qaldırıb Allaha dua etməyə başlayır. Süfrə ətrafında oturmuş Zeynalabdinin kiçik bacılarına deyir ki, mən dua etdikcə siz də "amin" deyin. Atasının bu duasından sonra .xeyir-bərəkət qapıları Zeynalabdinin üzünə açılmış olur

Ailə, övladlardan və ata-anadan təşkil olmuş elə bir mürəkkəb quruluşdur ki, onun sütunları məhəbbət və səmimiyyət üzərində dayanmışdır: Övlad valideynlərinin xidmətindədir, onlar isə övladlarının duaçısıdırlar. Bu minvalla onların ömrü sona yetir və övlad ədəb-ərkanla, Allahdan rəhmət diləməklə onları torpağa tapşırır. Çox keçmir özləri də ata və ya ana olurlar, bir də ayılıb görürlər ki, onlar da qocalmışlar. Onlar öz .valideynləri ilə necə davranmışlarsa onlarla da beləcə davranılır

.Əkilmişi yeyirik, əkirik ki, yesinlər

.Dünya əkin yeridir, biçənəyi bilsinlər

Amma, çox təəssüf ki, insanların bə`zisi valideyn kimi böyük ne`mətin qədrini bilmir, nankor çıxırlar. Xüsusilə də azdırıcı, yabançı mədəniyyətlərin havasına uymuş şəxslər hər şeyə öz xudibnlikləri, mənfəətləri çərçivəsində yanaşırlar. Belə insanlar üçün hər bir şey onları mənfəətə çatdıran vasitədir. Hətta valideynlərinə də iqtisadi gözlə baxırlar. Nə qədər ki, ataanalarının əllərindən bir iş gəlir, maddi köməkləri dəyir onların başına dolanırlar. Amma elə ki, işdən düşdülər və ya xəstələndilər, qocalıb "artıq bir yükə" çevrildilər, bu zaman artıq hər yolla bu bezdirici yükdən xilas olmağa çalışırlar. Elə nanəcib

övladlar da olur ki, hətta ata-anaları öldükdən sonra da onların bədən üzvlərini satıb qazanc əldə etmək istəyirlər. Nə qədər ki, valideyn işə yarayır sağmal inək kimi sağıb qanını sorurlar, elə ki, işə yaramadı, ən yaxşı halda aparıb qocalar evinə atır, bir yolla .başlarından edirlər

Axı, bu ata-ana bir ömür canını övlad yolunda çürütmüş, varını-yoxunu onun yolunda sərf etmişdir. İndi ki, qocalmışlar, əlləri bir iş tutmur deyə təhqirmi olunmalıdırlar?! !?Köməyə ehtiyacı olan bu qocaları ümidsiz qoymaq nə qədər insafsızlıqdır

Oğul artıq qoca anasının əlindən yorulub; bundan da pisi gəlin qaynanasının evdə... qalmasını istəmir, ona canlı mikrob kimi baxır; əmr edir ki, hələlik onlara evin bir küncündə yer ayırsınlar. Bir müddət keçir, hökm çıxarır ki, bu iylənmişi bir təhər başdan eləmək lazımdır. Oğul da itaətkar qul kimi başını aşağı salıb dinmir. Hünəri nədir arvadın sözünün üstünə söz desin. Arvadının camalını, cəlalını "yararsız" valideynindən üstün tutur. O hər nə işarə etsə canla-başla yerinə yetirir. Oğul evin bütün ixtiyarını, bəlkə desən, öz ixtiyarını da arvadın əlinə vermişdir. Arvad da ərini ağzı yüyənli at kimi hara dartsa ora da gedir. İxtiyar qadınların əlinə keçəndə kişiləri hara çəkdikləri mə`lumdur. Görən İslam Peyğəmbərinin (s) buyurduğu "Cənnət ?anaların ayaqları altındadır" şüarına sahib bir insan bu işi tutarmı

Bu yerdədir ki, Qur`ani-kərimin mübarək olan bu ayəsi qeyb üfüqündən baş qaldırıb fəryad edir: "Kişilər qadınlar üzərində ixtiyar sahibidirlər (onların hamisidirlər.) Bu, Allahın onlardan birini digərinə üstün

etməsi və (kişilərin) öz mallarından (qadınlar üçün) sərf etməsinə görədir. Əməlisaleh qadınlar (ərlərinə) itaətkardırlar. Allahın (onları) hifz etməsi müqabilində gizli şeyləri (ərlərinin sirlərini, mal-dövlətini, ərlərinin və özlərinin namusunu, şərəfini) qoruyub (saxlayırlar..."(١)

Ata-anaya ehtiram göstərmək İslam dinində o həddə tə`kid edilmişdir ki, hətta Qur`ani-kərim valideynlərin müşrik olduqları surətdə də ehti-ramını lazım bilir. Ata-ana – Allah eləməmiş – müşrik olsalar belə onlarla gözəl davranmaq, dünyəvi işlərdə xoş münasibət saxlamaq lazımdır. Amma dinə zidd məsələlərdə, halalın haram, haramın halal edilməsi kimi işlərdə onların yolunu tutmaq olmaz:

"Biz insana ata-anasına (yaxşılıq etməyi, valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı) tövsiyə etdik. Anası onu (bətnində) çox zəif bir halda daşımışdı. (Uşağın süddən) kəsilməsi isə iki il ərzində olur. (Biz insana buyurduq: "Mənə və ata-anana şükür et. Axır dönüş Mənədir! Əgər (ata-anan) bilmədiyin bir şeyi Mənə şərik qoşmağına cəhd göstərsələr, (bu işdə) onlara itaət etmə. (Qalan) dünya işlərində onlarla gözəl keçin (onlara itaət et.) Tövbə edib Mənə tərəf dönənlərin (İslamı qəbul edənlərin) yolunu tut. Sonra (qiyamət günü) Mənim hüzuruma qayıdacaqsınız. Mən də ((dünyada) nə etdiklərinizi (bir-bir) sizə xəbər verəcəyəm!"(٢)

"Biz insana ata-anasına yaxşılıq etməyi (onlarla gözəl davranmağı tövsiyə etdik. (Ey insan!) Əgər (valideynlərin) bilmədiyin bir şeyi Mənə şərik qoşmağa cəhd göstərsələr,



---

١- [۵] "Nisa, ٣۴.
٢- [۶] "Loğman", ١۴, ١۵.

onlara itaət etmə. Hamınız (qiyamət günü) Mənim hüzuruma qayıdacaqsınız. Mən də ((dünyada) nə etdiklərinizi sizə bir-bir xəbər verəcəyəm.”(١)

İslamın ilk illərində Mədinəyə gələn bə`zi yəhudi və ya məsihi cavanları müsəlman olurdular. Onlar öz şəhərlərinə qayıtdıqda ata-anaları ilə rəftarları o qədər dəyişirdi ki, valideynləri təəccüblənib deyirdilər: “Biz elə bilirdik Məhəm-mədin (s) dininə gəldikdən sonra artıq bizim üzümüzə baxmayacaqsınız. Amma, əksinə görürük ki, bizə olan rəftarınız əvvəlkindən də gözəl olmuş-dur. İndi bizə daha yaxşı baxır, daha diqqətli ”.olmusunuz

Övladları onların cavabında deyirdilər: “Vali-deynlə bu cür davranmağı İslam bizə buyurmuşdur. İslam dininin ən mühüm tapşırıqlarından biri ata-anaya hörmət ”.göstərib onların qayğısına qalmaq-dır

Bu cavabı eşidən valideynlər övladlarından xahiş edirdilər ki, onları da Mədinəyə apar-sınlar. Beləliklə, onlar da İslamla yaxın tanış-lıqdan sonra müsəlman olurdular. Çox .keçmirdi, ki, bütöv bir qəbilə İslamı qəbul edirdi

Üsuli-Kafi” kitabında rəvayət edilir ki, İmam Sadiqdən (ə) “Ata-anaya yaxşılıq edin”–“ ayəsinin təfsiri barədə soruşduqda Həzrət (s) belə cavab verir: “Sevdiyiniz şeylərdən .Allah yolunda xərcləməyənə qədər yaxşılığa çatmazsınız

Yaxşılıq odur ki, onlarla xoş davranasınız. Məbada, imkan verəsən onlar ehtiyacı olduqları şeyi istəməkdə sənə ağız açsınlar. Hətta ehtiyac-ları olmasa belə onların ”.səndən bir şey istəmə-lərinə razı olma



---

١- [٧] “Ənkəbut”, ٨.

İmam Sadiq (ə) təfsirin davamında deyir: “Əgər onların biri və ya hər ikisi sənin yanında (yaşayıb) qocalığın ən düşkün çağına yetərsə, onlara “Uf!” belə demə, üstlərinə qışqırıb acı söz söyləmə...”–ayəsinin mə`nası budur ki, əgər onlar səni narahat edib cana yığsalar belə sən onlara heç “uf” da demə! Əgər səni vursalar, !onlara əl qaldırma, müqavimət göstərib kənara itələmə

Ayədəki “onlarla xoş danış” cümləsinin mə`na-sı isə budur ki, əgər səni vursalar, sən ”!onlara de: “Allah sizi bağışlasın

.Budur “xoş danış” kəlməsinin mə`nası: Yə`ni, ehtiram və mehribanlıqla olan danışıq

Ayədəki “onların hər ikisinə acıyaraq mərhəmət qanadının altına al...” cümləsinin mə`nası budur ki, gözünü onlara ağartma, acıqlı baxışlarla onları süzmə! Əksinə, mehriban nəzərlərlə onlara bax. Səsini onların səsindən yuxarı qaldırma! Əlini onların (əlinin üstünə aparma! Yol gedəndə onlardan qabağa keçmə!”(١)

Həmçinin, “Üsuli-Kafi”də başqa bir rəvayətdə İmam Sadiqdən (ə) nəql edilir ki, buyurdu: “Əgər Allah-təala “uf” kəlməsindən daha aşağı bir kəlmə bilsəydi “uf” kəlməsini gətirməzdi. (Yə`ni “uf” demək bu mə`nanı verir ki, insanın ata-anası ona bir söz desin, bu söz övladın xoşuna gəlmədiyi üçün “eh”, “ax!” deməklə valideyninə (.e`tiraz etsin. Bu kəlmə inkarın ən aşağı, ən kiçik formasıdır

Əgər kimsə ata-anasına uf desə valideyninin üzünə ağ olmuşdur. Bu valideynin üzünə ağ olmağın ən aşağı



---

.Bürhan təfsiri, daş çapı, “İsra” surəsinin təfsiri, c. ١, səh, ۶٠١ [٨]-١

dərəcəsidir. Valideynə qarşı çıxmağın başqa bir növü də acı baxışlarla onlara ".baxmaqdır

Peyğəmbərimizin (s) və imamlarımızın (ə) həyatına, kəlamlarına nəzər salanda Qur`anın buyurduğu bu ali tə`lim-tərbiyə metodunu bütün incəliklərinə qədər .müşahidə edirik

Rəvayətlərdə deyilir: İmam Zeynalabdin (ə) anasına qarşı həddən artıq mehriban və qayğıkeş imiş. Ona deyəndə: "Sən anana qarşı hər kəsdən daha çox diqqətlisən, amma sənin onunla bir qabda yemək yediyini görməmişik, səbəbi nədir?"–Belə cavab verdi: "Qorxuram mən əlimi uzatdığım loğma anamın da ürəyindən keçə və bununla ".onun qəlbinə toxunmuş olam

Qur`anda göstərilən bu ayələr və həmçinin mə`sumlarımızın (ə) kəlamlarındakı tövsiyələrin hamısı insanı yüksək mə`nəvi kamilliyə doğru sövq etdirməkdədir. İnsanı kamilliyə aparacaq yol bə`zən bizim diqqət yetirmədiyimiz, əslində isə olduqca .əhəmiyyətli olan əxlaqi davranışlarımız-dan çox asılıdır

Qur`anın "həqqünnas", xüsusilə də valideyn haqqında buyruqlarını əziz Peyğəmbərimiz (s) ilk anlardan cəmiyyətə çatdırmaq istəmiş, ümmətinə örnək olsun deyə deyilənləri ilk və əməli olaraq öz rəftarında yaşatmışdır. Peyğəmbərlə (s) yanaşı yaxın səhabələri də onun izi ilə gedərək "sirati-müstəqim"dən kənara çıxmamağa .çalışmışlar. Bu yolda öz meyillərinə uyğun yox, Allahın istəyinə uyğun addım atmışlar

Bə`zən bizim doğru sandığımız yol, haqq bildiyimiz bir iş yanlış ola bilər. Hətta bir işi ,ibadət, itaət zənn edib

əslində günaha yolda qədəm götürmüş olarıq. Şeytan bə`zən insanın sorağına bu cür hiylələrlə gəlir. Hərdən haqla batili bir-birindən ayırmaq çox çətin olur. Bunun üçün də .hər bir işdə mə`sumlarımızın keçdikləri yollara diqqət etməliyik

İslamın ilk illərində Peyğəmbəri (s) görmədən onun dininə iman gətirmiş şəxslərdən biri də Yəmən torpağında yaşayırdı. Bu şəxsin adı Uveys Qərəni idi. O, saf imanla İslamı qəbul etmiş kamil bir mö`min idi. Saatlarla oturub Allahla razü-niyaz edərdi. Yeganə arzusu Peyğəmbəri (s) yaxından görüb söhbət etmək idi. Amma evdə qoca və xəstə anası tək olduğu üçün bu istəyini dilinə gətirə bilmirdi. Anası Uveysə onu tək qoyub getməyə icazə vermirdi. Uveys də canla-başla anasının qulluğunda durur, onun bir sözünü iki eləmirdi. Bir dəfə çox yalvarıb-yaxardıqdan sonra anası ona tez qayıtmaq şərtilə Mədinəyə getməsinə icazə verir. Uveysin sevincdən uçmağa qanadı yox idi. Tez hazırlaşıb Mədinəyə yola düşür. Mədinəyə çatan kimi Peyğəmbərin (s) sorağına gedir. Deyirlər ki, Peyğəmbər (s) səfərə gedib, bir-iki günə qayıdacaq. Uveys anasına söz verdiyi üçün, Peyğəmbəri (s) görməyə həddən artıq müştaq olmasına baxmayaraq gözləməyib geri qayıdır. Uveys ilahi vəzifəsinə əməl edir. Daha demir ki, eybi yox, bu qədər yolu gəlmişəm, bir gün gözləsəm də olar. Görünür, Allah onu çətin sınaqdan çıxarmaq istəyirmiş. Əgər Uveys anasının sözünü yerə salıb Peyğəmbəri (s) gözləsəydi, aydın məsələdir ki, Peyğəmbərin (s) də bu işdən xoşu gəlməyəcəkdi. Düşünün, Uveys qoca anasının acığı tutar, ondan narahat olar deyə, ən böyük arzusunun

üstündən xətt çəkir. Elə buna görə də İslam tarixində kamillik yolunu ustadsız başa .vuran yeganə şəxs olur

Peyğəmbər (s) geri döndüyündə, kimsə ona bir söz deməmiş, buyurur: “Burnuma ”.Yəmən torpağının qoxusu gəlir, Uveys burada olmuşdur

Uzun əsrlər boyu agah insanlar bu həqiqəti dərk edərək yoldan azmamaq üçün Əhli-.beytin (ə) izi ilə addımlamışlar

Böyük ariflərin, alimlərin son nəfəslərində dediyi vəsiyyətlərə nəzər salanda hamısının !bir məsələni tə`kidlə vurğuladığını görürük: Sileyi-rəhm, həqqünnas

Görən son nəfəslərini yaşayan bu insanlar niyə bu qədər həmin məsələni xüsusi vurğu !?ilə qeyd etmişlər

Son dövrün böyük əxlaq müəllimlərindən olan ariflər ustadı Əllamə Qazi, oğluna ünvanladığı vəsiyyətnaməsində mühüm mətləbləri qeyd etdikdən sonra sonda xüsusi ”!!!vurğu ilə bu tövsiyəni edir: “Allah, Allah, Allah–ki, heç kimin qəlbini sındırmayın

Qazi bu son cümləsinin əvvəlində üç dəfə “Allah” kəlməsini gətirməklə məsələnin .olduqca mühüm olduğunu göstərmək istəmişdir

Qazinin şagirdlərindən olan Ayətullah Nəcabət deyir: “Bir gün Qazinin yanına ”.getmişdim, dedi: “Boynunda kimin haqqı varsa gərək özünə qaytarasan

Onun bu sözündən sonra dedim: “Bu yaxınlarda mənim dərs dediyim tələbələrdən biri yaxşı dərs oxumurdu, bunun üçün onu tənbeh etdim. Tələbənin valideynindən də tərbiyə işlərində tənbeh etməyə icazə almışdım. Yeri gəlmişkən onu da deyim ki, həmin tələbə

”.indi burada deyil. Bunun üçün də onu tapıb halallıq almaq imkanım yoxdur

”.Qazi buyurdu: “Başqa yolun yoxdur, gərək onu tapasan

.Axı ünvanını bilmirəm–

!Gərək tapasan–

Ağa Qazi əlavə edib buyurdu: “Boynunda olan haqqı əda etməyincə ruhaniyyət qapıcı, Allaha qürbət babı, mə`rifət yolları üzünə bağlı qalacaq. Yə`ni bütün bunların hamısı Həzrəti Xudanın işləridir. Allah-təala Öz razılığını xalqın razı qalmasında qərar ”.vermişdir

Göründüyü kimi, əksər əxlaq ustadları ictimai və fərdi davranış qaydalarına, xalqın hüquqlarına riayət etməyə çox tə`kid etmişlər. Təbii olaraq insan ailə içərisində, işlədiyi yerdə digər insanlarla daha çox ünsiyyətdə olur. Bu baxımdan gündə gördüyü, qarşılaşdığı adamlarla rəftarına və danışığına daha çox fikir verməlidir. Xüsusilə, onun boynunda hər kəsdən daha çox haqqı olan valideynlərinə xüsusi qayğı ilə yanaşmalıdır. Mə`nəvi yüksəlişə varmaq üçün insanın özünü heç də dağa-daşa salması lazım deyil. Ariflərin ədasını çıxarmaqla insan kəramət sahibi olmur. Çoxlu kitab oxuyub söz əzbərləməklə insan hidayətə qovuşmur. Qur`ani-kərim buyurur: ”.“Sizlərdən ən kəramətlisi daha çox təqvalı olanınızdır

Ariflər Qur`anın buyruqlarına baş əyərək, Əhli-beytin (ə) göstərdiyi yolla gedərək .yüksək məqam sahibi olmuş, şagirdlərini də bu cür tərbiyə etmişlər

Həmin tərbiyənin bəhrəsini bu gün biz, kamil arif Ayətullahül-üzma Behcətin .timsalında görürük

Qazinin tələbəsi olan Ayətullah Behcət məhz ustadının sözünə qulaq asıb atasına itaət edəndən sonra mə`nəvi sirlər aləminə yol tapır. Həmin hadisəni xatırlamaq burada :yerinə düşərdi

Ayətullah Behcətin Əllamə Qazi ilə get-gəl etdiyini eşidən və Qazinin əxlaq məktəibni bəyənməyən bəzi şəxslər Ayətullah Behcətin atasına məktub yazıb onun haqq yoldan azdığını, bir sufinin yanına get-gəl etdiyini qeyd edirlər. (O zaman Behcətin ۱۸-۱۹ yaşı ancaq olardı.) Atası məktubun cavabında yazır ki, vacib əməllərdən başqa bir şey .öyrənməyinə və filankəslə (Ustad Qazi ilə) get-gəl etməyinə razı deyiləm

Ayətullah Behcət atasının yazdığı məktubla əlaqədar Əllamə Qazidən üzərinə düşən vəzifəsini soruşur. Ustad Qazi ona bu barədə təqlid etdiyi müctəhiddən sual etməsini buyurur. Ayətullah Behcət, Seyyid Əbülhəsən İsfahaninin yanına gedib məsələnin nə yerdə olduğunu danışanda, Əbülhəsən İsfahanidən "valideynə itaət etmək vacibdir"– .cavabını eşidir

.Bu əhvalatdan sonra dərin sükuta qərq olan Behcət daha heç kimlə danışmır

Ayətullah Behcətin dostu və tələbə yoldaşı Şeyx Abbas Quçani o illəri belə xatırlayır: "Ayətullah Behcət sükut ixtiyar edəndən sonra mənəviyyat aləmindən onun qəlbinə ".qapılar açılır. O məndən xahiş etdi ki, bu sirri heç kimə açmayım

Diqqət etdinizsə, o zamanın böyük mərcəyi-təqlidi olan Əbulhəsən İsfahani Quranın hökmünə müvafiq olaraq "atana itaət etmək vacibdir" hökmünü verir. Başqa cür ola da bilməzdi. Bundan daha maraqlısı, özü də

böyük müctəhid olan Əllamə Qazinin bu hökmü bildiyi halda “get, şəri vəzifəni təqlid etdiyin müctəhiddən soruş” deməsidir. Halubki, onun özü də bunu deyə bilərdi və zahirdə Behcəti Əbülhəsən İsfahaninin yanına göndərməyin elə də bir lüzumu yox idi. Amma şagirdlərini Əhli-beyt (ə) məktəibnin göstəriş- lərinə uyğun tərbiyə edən Qazi hər bir işdə zəmanənin mərcəyi təqlidinə itaət etməyi lazım bilir.

Allah-təala “əl-İsra” surəsinin ٢٣-cü ayəsində buyurur: “Rəbibn yalnız Ona ibadət etməyi və vali-deynlərə yaxşılıq etməyi buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında (yaşayıb) qoca-lığın ən düşkün çağına yetərsə, onlara: “Uf” belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış!”

Aşağıda dediklərimizə şahid olacaq minlərlə əhvalatlardan ancaq bir qismini nəql edirik.

### ANAYA XİDMƏT – İLAHİ EŞQƏ APARAN YOL

Əllamə Məhəmməd Hüseyn Hüseyni (Tehrani) özünün “Qur`anın nuru” adlı kitabında şahidi olduğu bir əhvalatı belə nəql edir: Günlərin biri Tehranda kitab almaq üçün “İslamiyyə” adlı kitab mağazasına getmişdim. Dükan sahibi ilə yaxın münasibətlərimiz olduğu üçün hər görüşümüzdə bir az dükanda oturub onunla söhbət edər, çay içib dincimi alardım. Bu dükan, mallarını topdan satdığı üçün kitabları dəstə bağlanmış halda birbaşa anbardan verərdi. Müştərilərinin əksə-riyyəti də royon kitabçıları idi.

Səhər saat doqquzda kitabçı ilə birlikdə dükanın anbarında kitablara baxırdım. Bu vaxt anbara kitab almaq üçün orta yaşlı bir kişi daxil oldu. Salam verib, anbarın bir küncünə keçib kitab seçməyə başladı. Hiss olunurdu ki, dükanın köhnə müştərilərindəndir. Kişi əlindəki dəri qayışı yerə sərib seçdiyi kitabları səliqə ilə onun üstünə yığmağa başladı. Seçdiyi kitablara diqqət etdim, gördüm əksərən Qur`an, məfatih, risalə, dua və bu .qəbildən olan kitablardır

Kitabları üst-üstə yığıb rahladıqdan sonra qayışla dörd bir tərəfdən möhkəm sarıyıb, qaldırıb çiyninə keçirdi. Əlliyə yaxın kitab yığmışdı. Dedim yazığın indi çiyni qırılıb düşər yerə. Çıxmaq istəyəndə birdən dayanıb yanıqlı səslə dedi: "Həbibim Allah, təbibim "!Allah, yarım, sevgili-canım, cananım

Üzünə baxdım, gördüm pörtüb; tər alnından süzülüb arıq sifətindəki dərin yarıqlardan .keçərək yamacda cığır açmış çeşmə kimi üzü aşağı axır

Dedim: "Ağacan! Dərvişcan! Tək yemək ədəbdən deyil, bizə də bir şey ver!" (Mə`nəvi (süfrənə bizi də qonaq elə

Bunu demişdim, başladı ətrafında dövr vuraraq hündürdən və yanıqlı səslə böyük arif və şair Baba Tahir Üryandan şe`r oxumağa. Şe`ri oxuyub dayandı. Yükünü yerə qoyub bir xeyli ağladı. Sonra tutqun çöhrəsi bahar təravətini duyan çiçəklər kimi :açılmağa başladı. Şad və xürrəm halda gülümsünüb alnının tərini sildi. Dedim

Əhsən! Afərin! Mən həqir, fəqir (alim birisi olsam da) yolda ilişib qalmışam. Sizin“ ”!duanıza möhtacam

Sözümə yenə arifanə bir şe`r oxumaqla cavab verdi. Dedi: “Əlhəmdulillah, yolun yaxşı yoldur. Seyyid! Məni ələ salırsan, nədir? Mənim özüm biçarə və möhtacam, sən də yükümüzün üstünə yük artırma! Mən sizi tanıyıram; “Qaim” məscidində imam camaatsınız. O məscidə gəlmişəm, yenə də gələcəyəm. Mənim bəlli bir yerim-yurdum yoxdur. Bir gün burdayam, o biri gün başqa yerdə. Gecələri gözümə yuxu getmir. ”.Anam vəfat edəndən sonra evə çox az-az gedirəm

Dedim: “İnayət Allah tərəfindəndir. Amma zahirinizdən belə bəlli olur ki, Allahın sizə ”?xüsusi inayəti olmuşdur. Bunun xas bir səbəbimi vardır

Dedi: “Bəli! Mənim qoca bir anam vardı: zəif və halsız. Neçə illər idi ki, xəstə halda yataqda yatırdı. Ona özüm baxır, hər bir istəyini yerinə yetirirdim: Yeməyini bişirir, əl-ayağını yuyurdum; bir sözlə, qulluğunda dururdum. Anamın xasiyyəti olduqca pis idi. Hərdən acıqlananda mənə söyüş yağdırır, mən isə dinməyib dözürdüm. Hər bir pis hərəkətinə qarşı təbəssümlə cavab verirdim. Buna görə evlənmirdim. Yaşım qırxı keçsə də anamın bu xasiyyəti ilə ailə qurmağı qeyri-mümkün hesab edirdim. Bilirdim ki, evlənsəm, ya geci-tezi ailəmiz dağılacaq, ya da başqa bir yolu bu idi ki, mən gərək .anamı atıb gedəydim

Anamı tək qoymağa vicdanım heç cür yol vermirdi. Bu üzdən də evlənmədim, dedim .mənim qismətimə də belə yazılıb, gərək dözəm

Anamın dözülməz xasiyyətinə səbir etməyimin nəticəsində hərdən gözlənilmədən qəlbimdə sanki şimşək çaxır, qəribə işartılar bərq vururdu. Təsəvvürəgəlməz rahatlıq, .xoş hallar keçirirdim. Əlbəttə, bu hallar keçici, davamsız olurdu

Qışın soyuq günlərindən birində anam tək qalıb qorxmasın deyə yatağımı o yatan otaqda salmışdım. Həm də deyirdim birdən anamın bir şeyə ehtiyacı olar, məni çağırar, eşitmərəm. Kuzəni həmişə su ilə doldurub yanıma qoyurdum ki, birdən anam .qalxıb su istəsə, tez, suyu ona verə bilim

Gecənin bir yarısı, alaqaranlıqda anam su istədi. Tez qalxıb kasanı doldurub ona .verdim, dedim: Buyur anacan

Anam yuxulu olduğu üçün mənim onun yanında olduğumdan xəbərsiz idi. Ona görə də başladı məni söyüb qarğımağa. Dedim, ana mən burdayam, al suyu! Anam kasanı alıb həmin andaca başıma çırpdı. Tez kasanı götürüb yenidən su ilə doldurub ona uzatdım .və dedim: Bağışla məni ana, eşitmədim, ona görə gec gəldim, üzr istəyirəm

Bir anlıq nə baş verdiyini anlamadım. Qəlbimdə bərq vuran qığılcımlar birdən püskürüb vulkana döndü. Günəş üfüqdən baş qaldırıb aləmi işıqlandırdığı kimi qəlbim nura qərq oldu. Həbibim, təbibim–Allahım

mənimlə danışırdı. Bu hal artıq keçici olmadı, o vaxtdan qəlbimdə bir nur ".parlamaqdadır

.Bu görüşümüzdən sonra mən onu bir daha görmə-dim

Bu əhvalatı mən həmin ətrafda yaşayan dost-larımdan bə`zisinə danışanda, dedilər .ki, biz onu tanıyırıq: Anası neçə ildir ki, dünyasını dəyişib, özündə də qəribə hallar olur

Kitabçı dostum dedi ki, o həmişə gəlib mənim dükanımdan kitab aparar. Aldığı kitabları səyyar şəkildə, hərdən bir yerdə, yolun bir kənarında dayanıb satar. Olduqca dəqiq adamdır. Ona görə də nə vaxt gəlsə, anbara ötürürəm, özü istədiyi qədər kitab seçib götürür. Kitabların pulunu da satandan sonra gətirib verir. Çox vaxt özünü cahil (adamlar kimi göstərir. Amma, əslində olduqca dərin adamdır.(١

Bu əhvalatı nəql etməkdə məqsədim anaya xidmətin mə`nəvi nəticələrini bəyan etmək idi. Ana qəlbi Allah mehrinin və sirrinin xəzinəsidir. Əgər bağlı olsa, asimanın .qapıları bağlanmışdır, əgər açıq olsa, asimanın qapıları açılmış olar

Çox görmüşük Allah yolunun yolçuları gecə namazlarına qalxmaqla, oruc tutub çillələr saxlamaqla bu yolu başa vurmağa çalışmışlar, ki, rəftarları ailədə pis olduğu üçün zəhmətlərinin bəhrəsini dadmamışlar. Uzun illərin məşəq-qətindən sonra bağlı qapı ilə .üzləşmişlər



---

"Məhəmməd Hüseyn Hüseyni (Terani), "Qur`anın nuru [٩] -١

Amma əhvalatını nəql etdiyimiz belə sadə insan-lar uzun və məşəqqətli riyazətlərə baş qoşmadan, təkcə həqqünnas məsələsinə riayət etməklə tez bir zamanda ali məqamlara çatmışlar. Həqqünnas dedikdə, insanın ətrafındakı adamların hüquqlarına riayət etməsi nəzərdə tutulur. Yə`ni sənin əlinin altındakı adamları incitməyəsən, ətrafındakılarla gözəl davranasan, sənə qarşı kobudluq olsa belə səbirli davranıb .güzəşt edəsən. Bir sözlə rəftarımıza çox diqqət yetirməliyik

## ATANIZDAN HALALLIQ ALIN

Məhəmməd Əli Mücahidi müəllifi olduğu “Övliyaların hüzurunda” adlı kitabında belə bir :xatirə nəql edir

Yaxın dostlarımdan olan Kaşani dünya görmüş, təqvalı bir şəxs idi. Həftənin əksər günləri onun evi qonaqla dolu olardı. Evi Allah dostlarının ümid məkanına çevrilmişdi. .Nə vaxt evinə getsəydin, süfrəsini açıq görərdin

Mərhum Kaşani bir dəfə mənə belə bir əhvalat danışdı: Bir nəfər cavan oğlan tez-tez məsləhət üçün yanıma gələr, həyatındakı çətinliklərdən şikayət edərdi. Mən .bacardığım köməyi ondan əsirgəmirdim, amma işləri nədənsə düzəlmirdi

Bir gün məni Həzrət Əlinin (ə) doğum günü münasibəti ilə düzənlənmiş mərasimə də`vət etdilər. Mən

həmin cavana dedim ki, bu gecə bərat gecəsidir, gəl sən də mənimlə gedək, görək nə .olur

Olduqca maraqlı bir mərasim düzənlənmişdi. Məddahlar biri digərinin ardınca öz mədhiyyələrini oxuyur, camaat da arada onlara qoşulub səs verir, salavat göndərirdi. Mərasimin başlanmasından bir saat keçmiş Ağa Müctəhidi gəlib çıxdı və mənim .yanımda boş yerdə əyləşdi

Həmin cavan mənim Ağa Müctəhidiyə hədsiz ehtiram göstərdiyimi görüb anladı ki, bu şəxs kimdirsə, kəramətli bir insan olmalıdır. Bu üzdən o, elə hey məndən xahiş edirdi .ki, onun məsələsini Ağa Müctəhidiyə söyləyim, bəlkə bir yol göstərdi

Həmin cavanı ağa Müctəhidi ilə tanış etdim və dedim: Neçə vaxtdır ki, düşdüyü problemlərin həllinə çalışır, amma bir yerə çıxa bilmir. Bu gecə əziz bir gecədir, lütf .göstərib ona kömək edə bilsəniz sizdən çox məmnun olardım

Ağa Müctəhidi nüfuzlu baxışlarını cavanın üzünə zilləyib bir anlığa fikrə getdi. Bir neçə saniyədən sonra ona buyurdu: Siz atanızın razılığını əldə etməlisiniz! Cavan oğlan .təəccüblənmiş halda dedi: Atam iki il olar ki, rəhmətə gedib

Elə sənin problemlərin də iki il olar başlayıb. Yəqin axırıncı gün atanla aranızda olan– söhbəti unutmamısan? Atanın ömrünün son saatlarında qəlbini qırmısan. Atanı həmin !böhranlı dəqiqələrdə ürəyi qəhərli halda yalqız qoyub getdin

Bu sözləri eşidəndə cavanı xəcalət təri basdı. Üzünü mənə tutub dedi: Ağa düz deyir. Gərək onu tək qoymayaydım. Mən onun yeganə oğlu idim. Çox böyük səhv etmişəm! ?Yaxşı, indi mən neyləyim

Kaşani nəql edib deyir ki, Ağa Müctəhidi bir neçə dəqiqədən sonra həmin oğlana nə .edəcəyini tapşırıb, bizimlə xudafizləşib getdi

Həmin cavan oğlanın işləri Ağa Müctəhidinin tapşırığına əməl edəndən sonra .qaydasına düşür

Cənab Kaşani cavanın problemlərinin həlli üçün Ağa Müchədinin verdiyi tapşırığın nə olduğunu demədi. Amma dedi ki, cavan həmin görüşdən bir neçə gün sonra atasını .yuxuda görür və atası ondan razı qaldığını bildirir

Atası oğluna deyir: Sən bu əməlinlə bərzəx aləmində mənim yolumun üstündən böyük (bir maneəni götürdün.(١

Allah-təala bizə yalnız Ona ibadət etməyi əmr edəndən sonra ata-anaya yaxşılıq etməyimizi tapşırır. Xüsusən valideynin qocalıq çağlarını xatırladıb deyir ki, əgər onlardan biri və ya hər ikisi qocalığın ahıl çağlarına çatarsa (təbii ki, belə yaşlarda sizin zəhmətiniz də artacaq) məbada onların xətrinə toxunacaq bir söz deyəsiniz. Allah-təala bizə öz danışığımız və davranışımızla onları əziyyətə salmamağımızı tövsiyə edir. .Deyir: Valideynlərinizlə hörmətlə davranın

Bu ayədən belə nəticə çıxardırıq ki, ata-ananın Allah yanında məqamı olduqca yüksək və əziz tutulur. Bu



---

.Mücahidi Məhəmmədəli, “Dər məhzəre lahutiyan”, c. ١, səh. ٢٣٥, ٢٣٧ [١٠]-١

səbəbdəndir ki, bizi Özünə ibadət etməyə də`vət edəndən sonra valideynlərə yaxşılıq etməyə səsləyir. Ata-anaya yaxşılıq etmək heç bir şərtlə yanaşı qeyd olunmur. Validenə hörmət ümumi bir göstərişdir. Hətta, əgər ata-ana kafir olsalar belə onların hüququna riayət olunmalıdır. Xüsusilə də qocalıq çağlarında onların əlindən tutmaq .tapşırılır

Valideynin üzünə ağ olmaq böyük günahlardan sayılır və bağışlanılmazdır. Çünki, valideynin bizim boynumuzda olan haqqı “həqqünnas” növün-dəndir. Allah-təala həqqünnasın paymal olmasını bağışlamır. Əgər bir kəsin haqqını tapdala-mışıqsa onu bərpa etməli, razılığını əldə etməliyik. O cümlədən ata-ana haqqı ən böyük .hüquqlardan biridir. Bu hüquqa riayət edilməli, onun pozulmasına yol verilməməlidir

Bu məzmunda olan hekayələr onu göstərir ki, bütün günahlar elə bu dünyada insanın yaxasından yapışır. Axirət dünyasına qədəm qoyduqda isə vəziyyət daha ağır olur. Bunun üçün də fürsət varkən bu dünyada günahların yuyulmasına çalışmaq lazımdır .ki, hər iki dünya səadətini əldə etmiş olaq

### (ANA QARĞIŞI VƏ QƏBİR ƏZABI (١

Nəql olunur ki, günlərin birində Peyğəmbər (s) məsciddə olduğu vaxt Cəbrayıl (ə) nazil :olub, salam verdikdən sonra dedi

Ey Allahın Rəsulu! Bəqi qəbiristanlığına gedin. Bəlkə sizin mübarək qədəmlərinizin“ ”.sayəsində dar və qaranlıq qəbir içində əzab çəkənlər nicat tapalar

Peyğəmbər (s) səhabələrdən bir neçəsi ilə birlikdə Bəqi qəbristanlığına yollandı. Əli (ə) Peyğəmbərlə (s) yolda rastlaşarkən salam verib hara getdiklərini soruşanda “Bəqi qəbristanlığına”–deyə Peyğəmbər (s) cavab verdi. Həzrət Əli (ə) də onlarla birgə Bəqi qəbristanlığına yollandı. Qəbristanlığa çatanda Peyğəmbər (s) qəbirlərin birindən :gələn səsi eşitdi

!Dadıma çat, ya Rəsuləllah“

Peyğəmbər (s) səs gələn qəbirə yaxınlaşıb dedi: “Ey qəbir əhli! Nə üçün və necə əzab .çəkdiyinin səbəbini söylə

Qəbirdən cavab gəldi: “Ey günahkarların dadına yetən! Ana qarğışı məni bu əzaba ”.düçar etmişdir. Ona görə ki, anamı çox incitmişdim

Peyğəmbər (s) üzünü Bilal Həbəşiyə tutub dedi: “Mədinə camaatına xəbər verin ki, hamı öz ölənlərinin qəbirləri ətrafında toplaşsın.” Bilalın çağırışını eşidən Mədinə camaatı qəbristanlığa toplaşdılar. Beli bükülmüş qoca bir qarı da gəlib həmin qəbrin kənarında dayandı. Qarı Peyğəmbərə (s) salam verib, soruşdu: “Ey Allahın Rəsulu! Bizi ”?buraya yığmağınızın səbəbi nədir

.Ay qarı, bu sənin övladının qəbridir?–deyə Peyğəmbər (s) soruşdu“

.Qarı dedi: Bəli

Peyğəmbər (s) qarıya dedi: "Sənin övladın çox dəhşətli əzaba düçar olub. Gəl sən onun təqsirindən keç və haqqını ona halal et!"

"Yox, onu heç vaxt bağışlamaram!–deyə qarı dilləndi.

Peyğəmbər (s) səbəbini soruşanda qarı dedi: "Ey Allahın rəsulu! Bu uşağı min bir əzab-əziyyətlə böyütdüm ki, qocalanda mənə hayan olsun. Amma o, böyüyüb mənə daha da əziyyət verdi.

Peyğəmbər (s) buyurdu:

"Ay qarı, övladının təqsirindən keç ki, bu dəhşətli əzabdan qurtula bilsin."

Peyğəmbər (s) əllərini göyə qaldırıb dua etməyə başladı:

"Ey Rəbbim, Səni and verirəm "Pənc tən Ali əba hörmətinə, bu övladın səsini anasının qulağına çatdır. Bəlkə ana ürəyi övladının yalvarışlı səsini eşidib rəhmə gələ!" Sonra üzünü qarıya tutub dedi:

"Qulağını oğlunun qəbrinə söykə ki, onun fəryad səsini eşidəsən." Qarı qulağını qəbrə söykəyəndə ürək ağrıdan nalə səsi eşitdi. İxtiyarsız olaraq ağlamağa başladı. Qarı dedi:

"Ey günahkarlara şəfaət edən, bu necə fəryad və nalə səsidir ki, qəbirdən gəlir? O deyir: "Başımın üstündə və ayağımın altında, sağ və sol tərəfimdə hər yer alovdur! Ey ana! Məni bağışla və güna-hımdan keç. Yoxsa qiyamət gününə qədər bu əzab içində qalacağam."

Bu sözləri eşidəndən sonra qarının ürəyi yumşaldı və oğlunun halına acıyaraq dedi: “Ey ”.Allahım! Övladımın günahından keçdim və onu bağışladım

Ana övladına halallıq verən kimi Allah-təala öz rəhmət libasını ona geydirib, .günahlarını əfv etdi

:Qəbirdən səs gəldi

(Ay ana! Sən məndən razı olduğun kimi, Allah-təala da səndən razı olsun.”(١“

### (ANA QARĞIŞI VƏ QƏBİR ƏZABI (٢

Günlərin birində Əshabi-Kəsa—Peyğəmbər (s), Əli (ə), Zəhra (s), İmam Həsən (ə) və İmam Hüseyn (ə) Bəqi qəbristanlığında olarkən qəbirlərdən birindən əzablı səsin :gəldiyini eşitdilər. Peyğəmbər (s) üzünü həmin qəbrə tutub ölünü səslədi

”!Ey Allahın bəndəsi! Allahın izni ilə qəbirdən qalx“

Peyğəmbərin (s) mö`cüzəsi nəticəsində qəbir aralandı və qəbirdən cavan bir oğlan çıxdı. Onun üzü qaralmış və



---

.Qafillərin tənbehi”, səh. ٨٨“ [١١]-١

əl-ayağı zəncirlənmişdi. Həzrət (s) həmin cavana buyurdu: “Vay olsun sənə! Axı hansı ”?əməlinə görə belə dəhşətli əzaba düçar olmusan

Ey Allahın Rəsulu! Anam məndən narazı olduğu üçün bu əzab içindəyəm.”–deyə“ .həmin cavan cavab verdi

”?Peyğəmbər (s) ondan soruşdu: “Məgər sən anana nə etmisən

Oğlan cavab verdi: “Bir gün evə qayıdanda arvadım anamdan giley-güzar etməyə başladı. Bunu eşidəndə çox əsəbiləşdim. Anam təndirdə çörək bişirirdi. Əsəbi halda anama yaxınlaşıb onu təndirə itələdim. Səs-küyə qonşular yığışıb gəldi. Anam yanmış !döşünü göstərərək əlini göyə qaldırıb dedi: “İlahi sən özün intiqamımı oğlumdan al

Ya Rəsuləllah! Anamın qarğışından üç gün sonra öldüm və qəbir evində bu əzaba ”.düçar olmuşam. Nə olar mənə dua edin ki, bu əzabdan qurtula bilim

Peyğəmbər (s) yanında olanlara buyurdu: “Bu cavanın anasını buraya gətirin. Çünki anası halallıq verməyincə duamız qəbul olmaz.” Peyğəmbərin (s) səhabələri oğlanın :anasını qəbristanlığa gətirdilər. Peyğəmbər (s) buyurdu

”.Ey ana! Oğlunun günahlarını bağışla ki, qəbir əzabından qurtula bilsin“

!Qadın dedi: “Mən onu heç vaxt bağışlamaram

Peyğəmbər (s), Əli (ə), həzrət Zəhra (s) və imam Həsən (ə) nə qədər israr etdilərsə də qadın razı olmadı. Sonra

:İmam Hüseynə (ə) çatanda üzünü həmin qadına tutub buyurdu

Ey qadın! Babamın, atamın, anamın və qardaşımın şəfaətini qəbul etmədin. Heç“ ”.olmasa mənim şəfaətimi qəbul et

Qadın başını qaldırıb göyə baxdı. Sonra hər iki əliylə İmam Hüseynin (ə) əbasını tutub :dedi

”.Oğlumun təqsirindən keçdim və haqqımı ona halal etdim“

Peyğəmbər (s) buyurdu: “Mənimçün çox təəccüb-lüdür ki, mənim, kürəkənimin (Əli), qızımın və Həsənin (ə) şəfaətini rədd etdiyin halda ancaq Hüseynin (ə) şəfaətini qəbul ”.etdin

Ya Rəsuləllah! Hüseynin (ə) də şəfaətini qəbul etmək istəmirdim. Birdən göy üzünün“ :qapıları açıldı və əllərində alovlu dəmirlər tutmuş mələklər mənə dedilər

Hüseynin şəfaətini qəbul et. Yoxsa bu qızmış dəmirlərlə səni vuracağıq. Hüseynin (ə)“ (şəfaətini qəbul etməyimin əsas səbəbi bu idi.(١

## ATA QATİLİ ÇOX YAŞAMAZ

Mütəvəkkil, (Abbasi xəlifəsi) Əli (ə) övladlarıyla qatı düşmən idi. O, İmam Hüseynin (ə) hərəmi ətrafında dəfn olunmuş səhabələrdən on yeddisinin qəbrini



---

(Töhfətul-vaizin”, c. ١, səh, ١٣١. (Minhacüs-sadiqin dediklərinə əsasən“ [١٢]-١

dağıtdırmışdı. Onun xilafət etdiyi dövrdə ələvilərə, xüsusilə də Mədinə şəhərində yaşayan seyyidlərə çox əzab-əziyyət edirdilər. Bu ağır vəziyyət ۲۴۷-ci (h.q) ilə qədər davam etdi. Amma Mütəvəkkilin ölümündən sonra oğlu Müntəsir hakimiyyətə gəldi və .vəziyyət tamamilə dəyişdi

Atasından tam fərqli olaraq Müntəsir, Peyğəmbərin (s) Əhli-beytinə xüsusi hörmət göstərər və İmam Hüseynin (ə) zəvvarlarının ziyarət etməsinə heç bir maneəçilik törətməzdi. Onun əmrilə “Fədəki”(۱) İmam Həsənin (ə) övladlarına qaytardılar. O, .bundan əlavə Mədinə əlvilərinə pul və mal da göndərdi

:Mütəvəkkilin ölümünün səbəbi haqqında belə yazılır

Həzrət Əlini (ə) öz düşməni hesab edən Mütəvəkkil həmişə o Həzrətə hörmətsizlik“ edərdi. Bir dəfə yenə öz çirkin adəti üzrə saray məclislərindən birində Həzrət Əlinin (ə) şəxsiyyətinə hörmətsizlik edəndə, oğlu Müntəsir onun bu ədəbsiz rəftarına öz .e`tirazını bildirir. Mütəvəkkil isə bu cəsarətinə görə oğlunu tənbeh edir

Bu əhvalatdan sonra atasından kinli qalan Müntəsir münasib bir vaxtda onu qətlə yetirməyi qərara alır. O, müəllimi Əbu Übeydə ilə bu haqda məsləhətləşəndə müəllimi :ona deyir

Həzrət Əlinin (ə) şəxsiyyətini təhqir edən adamı öldürmək vacibdir. Amma bunu da“ bilməlisən ki, atasını öldürən şəxsin ömrü qısa olur. Müntəsir qəti qərara

səh:۳۶

---

.Peyğəmbərin (s) sağlığında Həzrət Zəhraya (s) bağışladığı torpaq sahəsi [۱۳] -۱

gələndən sonra bu işi Mütəvəkkilin xüsusi qulamlarından bir neçəsinə həvalə edir. Mütəvəkkil bir gün yenə saray xidmətçiləri ilə eyş-işrət məclisində idi. Elə bu vaxt “Kiçik Buğa” məclisə daxil oldu. Onun işarəsi ilə bütün xidmətçilər məclisi tərk etdilər. Yalnız Fəth ibn Xaqan Mütəvəkkilin yanında qaldı. Mütəvəkkili öldürmək üçün gələn qulamlar .qılınclarını siyirib onun üstünə hücum çəkirlər

Vəziyyəti belə görən Fəth ibn Xaqan özünü Mütəvəkkilin üstünə atıb qışqırmağa ”?başladı: “Vay halınıza! Siz Mütəvəkkili öldürmək istəyirsiniz

Qulamlar onların hər ikisini öldürəndən sonra Müntəsirin yanına qayıdıb ona xilafət .müjdəsi verirlər

Mütəvəkkil qətlə yetən gecənin səhəri günü oğlu, ۲۵ yaşlı Müntəsir xilafəti ələ aldı. Müntəsirin xilafəti dövründə bir dəfə sarayda onun ayaqları altına salınmış bir xalı diqqətimi özünə cəlb etdi. Xalının kənarlarında keçmiş xəlifələrdən bir neçəsinin təsviri toxunmuşdu. Fars əlifbası ilə hər birinin altından onların adı və xilafət etdikləri müddət qeyd olunmuşdu. Fars dilini çox gözəl bildiyim üçün orada yazılanları oxuya bilirdim. :Xalının sağ guşəsindəki rəsmin altında bu sözlər yazılmışdı

Bu, atasını qətlə yetirmiş Şiruyənin rəsmidir. O, cəmi altı ay xilafət etmişdir.” Xalının“ sol tərəfindəki xəlifənin rəsminin altında belə bir cümlə qeyd olunmuşdur: “Bu öz əmisi oğlu Vəlid ibn Yəzid ibn Əbdülməliki öldürmüş Yəzid ibn Vəlid ibn Əbdülməlikin ”.rəsmidir. Onun hakimiyyət dövrü altı ay olmuşdur

Müntəsirin ayaqları altına sərilmiş xalının sağ və solundakı bu təsvirlərin yanaşı toxunmasına təəccüb etdim. Qəribə burasındaydı ki, Müntəsir də öz atasının qatili idi. Özözümə fikirləşdim ki, məbada onun da xilafət dövrü belə qısa ola. Amma gümanımda (yanılmamışdım. Müntəsir atasının qətlindən altı ay sonra vəfat etdi.(١

## ATASINA ƏL TUTMAYAN KASIB OLAR

Nəql olunur: "Peyğəmbərin (s) zamanında kasıb bir kişi yaşayırmış. Bu kişinin varlı bir .oğlu var idi ki, əsla atasına əl tutmazdı

:Bir gün bu kasıb kişi Peyğəmbərin (s) hüzurunda öz övladından gileylənib dedi

Ey Rəsuləllah! Mən çox kasıbam. Amma oğlumun var-dövləti başından aşsa da mənə" .heç bir xeyri yoxdur. Çünki o maddi cəhətdən azacıq da olsun mənə yardım etmir

Peyğəmbər (s) kişinin oğlunu çağırıb dedi: Niyə atana əl tutmursan? Nəyə görə onun yemək və geyimini tə`min etmirsən? Arvad-uşağının nəfəqəsi (gündəlik xərcləri) kimi, atanın da nəfəqəsi sənə vacibdir. Gərək imkanın olduğu qədər atanın gündəlik xərcini ".ödəyəsən



---

.Pəndi-tarix", c. ١, səh. ٧٣" [١۴] -١

Sonra əlavə edib dedi: "Atanın bu aylıq tələbatını mən ödəyirəm. Amma gələn aydan ".e`tibarən sən özün verməlisən

Peyğəmbər (s) bir miqdar xurma, buğda və digər ərzaq məhsullarından kişiyə verib .yola saldı

Beləliklə, ay sona yetdi. Peyğəmbərin (s) kasıb kişiyə verdiyi azuqə artıq bitmişdi. Kişinin oğlundan da bir xəbər çıxmadı. O, Peyğəmbərin (s) tapşırığını əhəmiyyətsiz sayaraq, atasına xərclik vermədi. Zavallı kişi Peyğəmbərin (s) yanına gedib :şikayətləndi

Ya Rəsuləllah! Oğlum hələ də mənə xərclik vermir. Mənim yeməyə və geyməyə bir şeyim yoxdur." Peyğəmbər (s) həmin kişinin oğlunu çağırıb atasına xərclik :vermədiyinin səbəbini soruşdu. Oğlan dedi

Ya Rəsuləllah! Mənim heç nəyim yoxdur. Atam yalandan deyir ki, mən var-dövlət " .sahibiyəm. Hətta mən arvad-uşağımın da xərcini tə`min edə bilmirəm

Peyğəmbər (s) buyurdu: "Atan yalan demir, bu sənsən ki, yalan deyirsən. Bunu da bil ".ki, axşam olmamış sən atandan da fəqir olub pis günə qalacaqsan

Axşamın düşməsinə hələ qalırdı. Oğlanın qonşuları qapını döyüb dedilər: Sənin xurma və buğda anbarlarından qalxan üfunət iyi bizi narahat edir. Çünki xurmalar qurd basmış və buğdalar da kiflənmişdir. Anbardakı iylənmiş məhsulunu apar şəhərdən ".kənarda basdır

Cavan oğlan anbarların qapısını açanda doğrudan da xurma və buğdaların iyləndiyini gördü. Əlacsız qalıb

anbardakı xarab olmuş məhsulu şəhərdən kənara daşıtdırmaq üçün bir neçə hambal tutdu. Hambalların zəhmət haqqını vermək üçün sandıqçanı açanda oradakı pulların dəmir parçasına döndüyünü gördü. Oğlan hamballara dedi: “Sandıqçanın içində pul .yoxdur. Mən sizin zəhmət haqqınızı ödəyə bilməyəcəyəm

.Hamballar bunu eşidəndə onu o ki, var döydülər. Ona lə`nət deyə-deyə çıxıb getdilər

:Peyğəmbər (s) bu xəbəri eşidəndə dedi

Bütün bunlar oğlanın atasına–“Atam yalan deyir, mənim heç nəyim yoxdur”–“ .deməsinin nəticəsidir

#### ANANI UNUTMAĞIN AQİBƏTİ

Nəql olunur ki, Bəni-İsrail tayfasından olan Curəyh adlı cavan oğlan biyabanda xüsusi bir yerdə ibadətlə məşğul olardı. Onun bu ibadət və bəndəliyini görən bir çoxları, o .cümlədən də dövrün padşahı Curəyhə mürid olmuşdular

Bir gün anası Curəyhi görmək üçün biyabana, onun ibadət yerinə gəlir. O, həmişəki adəti üzrə yenə də ibadətlə məşğul idi. Anası onu çox səslədi. Amma Curəyh namazını :kəsib ona cavab vermədi.(۱) Anası onu qarğıyıb dedi



---

Həzrət Məhəmməd (s) buyurdu: “Əgər Curəyh alim olsaydı, müstəhəbbi namazı [۱۵] -۱ .kəsib anaya cavab verməyin savabının daha çox olduğunu bilərdi

Ey oğul! Səni görüm fasiqlərə tay olmamış bu dünyadan getməyəsən. Mən bu uzun-“ uzadı yolu səni görmək üçün gəlmişəm. Səni nə qədər səsləyirəmsə də cavab ”.vermirsən, qapını da üzümə açmırsan

Qadın bunu deyib getdi. O dövrün abidləri camaatın, o cümlədən də padşahın Curəyhə olan xüsusi məhəbbətindən xəbərdar idilər. Ona görə də Curəyhə paxıllıq edirdilər. Elə bu səbəbdən də onu öldürmək qərarına gəldilər. Onlar əxlaqsız bir qadına pul verib :dedilər

Sənin uşağın dünyaya gələn kimi, onu Curəyhin ibadətgahına apar. De ki, qeyri-“ ”.qanuni doğulan bu uşağın atası sənsən və mən onu böyüdə bilmərəm

Əxlaqsız qadın abidlərin qoyduğu şərti və pulu qəbul etdi. O, öncədən deyildiyi kimi, .uşağı bir parçaya büküb Curəyhin ibadətgahına yollandı

Üzünü Curəyhə tutub dedi: “Ey abid! Bu uşaq səndən törəyib. Onu böyüdüb başa ”.çatdırmaq da sənin vəzifəndir

Curəyhin düşmənlərindən bir neçəsi həmin uşağı padşahın hüzuruna aparıb dedilər: “Gördüyünüz bu uşaq qeyri-qanuni yolla Curəyhdən törəyib. Elə bir şəxsdən ki, .padşahın özü onun xüsusi müridlərindəndir

Padşah bu barədə heç bir araşdırma aparmadan Curəyhin ibadətgahını dağıtdırdı. Curəyhin də əl-ayağını zəncirləyib sürüyə-sürüyə padşahın yanına apardılar. Padşah əmr etdi: Camaata xəbər verin bir yerə

(toplaşsınlar. Qoy hamı onun dar ağacından asıldığını görüb, ibrət alsınlar.(۱)

Bəli! Budur anaya diqqətsizliyin acı aqibəti; övlad sevgisi ilə coşub-daşan ana ürəyini incitməyin nəticəsi; Curəyh, ana qarğışı ilə elə bir səviyyəyə çatdı ki, dar ağacından .asılan zaman fasiqlər onun ətrafına yığılıb, üzünə tüpürürdülər

### ATASINA LAQEYD OLANIN AQİBƏTİ

Yusif (ə) Misir padşahı olandan sonra qardaşları ərzaq məhsulları almaq üçün həmin vilayətə gedirlər. O, qardaşlarının vasitəsilə köynəyini atasına göndərir. Həmin köynəyi .həzrət Yaqubun (ə) kor olmuş gözlərinə sürtən kimi gözləri açılır

Həzrət Yaqubun (ə) tapşırığı ilə elə həmin gün ailə üzvləri Misirə yola düşürlər. Karvan böyük şadlıqla və iti sür`ətlə Misirə tərəf hərəkət edirdi. Kən`andan yola düşən karvan doqquz günə mənzil başına çatdı. Çünki neçə il övlad həsrətində olan ata .oğlunu görməyə gedirdi

Atası və qardaşlarının gəlişini eşidən Yusif (ə) təmtəraqla onları qarşılamaq üçün yola düşdü. Padşahın xüsusi qoşunundan əlavə, minlərlə şəhər camaatı Yusifi (ə) müşayiət .edirdi

:Bu təmtəraqlı mərasimi görən Yaqub (ə) oğlu Yəhudadan soruşdu



---

."Cameən-nurin" [۱۶] -۱

?Bu gələn Misir padşahıdır

Xeyr atacan. Bu oğlun Yusifdir"– deyə Yəhuda cavab verdi. Yaqub (ə) atdan enib "
.Yusifə (ə) tərəf addımladı

Yusif (ə) uzaqdan atasını görəndə tez atdan enmək istədi. Amma öz padşahlıq məqamına görə bir az ləngidi. Atası ilə salamlaşıb görüşəndən sonra (mərasim sona :yetəndə) Cəbrayıl (ə) nazil olub dedi

:Ey Yusif! Allah-təala buyurur"

Bizim saleh bəndəmiz və sənin zəhmətkeş atan olan Yaqubu (ə) görəndə nəyə görə" ondan sonra (bir az gec) atdan endin? İndi isə əlini aç. Elə bu vaxt Yusifin barmaqları ".arasından parlaq bir nur xaric oldu

?Yusif (ə) dedi: Ey Cəbrayıl! Barmaqlarımın arasından çıxan bu nur nə idi belə

Bu peyğəmbərlik nuru idi. Sənin atandan sonra atdan enməyin, atana qarşı" hörmətsizlik sayılır- dı. Ona görə də Allah-təala peyğəmbərliyi sənin nəslindən kəsdi. Səndən sonra gələcək peyğəmbər daha sənin nəslindən olmayacaq." – deyə Cəbrayıl .(ə) cavab verdi

### ATA-ANAYA EHSANIN NƏTİCƏSİ

Valideynlərinə ehsan və yaxşılıq edən insanlar haqqında söz açmazdan əvvəl burada :mühüm bir məsələyə işarə edirik

İslam dinində ata-anaya yaxşılıq və hörmət etmək mühüm məsələlərdən biri sayılır. Ona görə də Allah-təala

.Qur`anın dörd surəsində bu məsələni Allahı dərklə eyni səviyyədə tutmuşdur

:O cümlədən də Bəqərə surəsinin ۸۳-cü ayəsində buyurur-۱

Yadınıza gətirin ki, Biz bir zaman İsrail oğullarından: “Allahdan qeyrisinə ibadət“ ...etməyin, valideynlərinizə ehsan (yaxşılıq, kömək) edin

:Həmçinin Ən`am surəsinin ۱۵۱-ci ayəsində buyurur-۲

Ya Rəsuləllah! De: “Gəlin Rəbibnizin sizə nələri haram etdiyini deyim: Ona heç bir şərik“ ”...qoşmayın; ata-anaya yaxşılıq edin

Allah-təala Nisa surəsinin ۳۶-cı ayəsində camaata xitab edərək onları ibadətə-۳ :də`vət edib buyurur

”...Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın! Ata-anaya yaxşılıq edin“

:Həmçinin İsra surəsinin ۲۳-cü ayəsində Peyğəmbərə (s) xitab olaraq buyurulmuşdur-۴

Rəbibn yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi (onlara yaxşı baxıb“ ”.gözəl davranmağı) buyurmuşdur

:Ata-anaya yaxşılıq etmək haqqında İslam Peyğəmbəri (s) buyurmuşdur

Validenlərə hörmət və yaxşılıq etmək, namaz, oruc, həcc, ümrə və Allah yolundakı“ (cihaddan qat-qat üstündür.”(۱)



---

.Camiüs-sadat”, c. ۲, səh. ۲۶۴“ [۱۷] -۱

Ata-anaya yaxşılıq etmək fəzilətli əməllərdən biri sayılır. Hətta valideynin üzünə .baxmaq belə Həcc ziyarətinin savabı ilə bir sırada qeyd olunmuşdur

:Peyğəmbər (s) buyurur

Elə bir gözəl əməl sahibi olan övlad yoxdur ki, hər dəfə valideynlərinə rəhmət və“ qayğıkeş nəzərlərlə baxdığında, Allah-təala həmin övladın hər baxışının əvəzində onun ”.əməl dəftərinə qəbul olmuş bir Həccin savabını yazmamış olsun

?Ərz olundu: “Ey Allahın Rəsulu! Əgər gündə yüz kərə baxsa necə

Buyurdu: “Bəli! Mehriban Allah o həddə böyük və pakdır ki, hətta min kərə baxsa belə ”.ona hər baxışın müqabilində həmin savabı yazar

### ATAYA HÖRMƏT VƏ PEYĞƏMBƏRLİK NURU

Lavi, Həzrət Yusifin (ə) ən böyük qardaşı idi. Onun o biri qardaşlarından fərqli olaraq bir çox müsbət xüsusiyyətləri vardı. Biz burada bir-iki nümunəyə işarə etməyi lazım .bilirik

Lavi digər qardaşlarından daha ağıllı və uzaqgörən idi. Qardaşı Yusiflə (ə) də çox mehribanlıqla rəftar edərdi. Qardaşları Yusifi (ə) öldürmək istəyəndə o belə bir təklif :edir

Gəlin Yusifi su quyusuna ataq. Su götürmək üçün quyuya yaxınlaşan karvan onu oradan çıxarıb özləri ilə başqa bir vilayətə aparacaqlar. Qardaşlar onun bu təklifi ilə (razılaşırlar.(١

Həmçinin Lavi atasına çox bağlı idi. Onu narahat görməyə dözümü yox idi. Elə bu səbəbdən də Yusifin (ə) anabir qardaşı olan Benyamini oğurluq adıyla öz yanında saxlamaq istədiyini eşidəndə Lavi qardaşlarına deyir: Mən sizinlə Kən`ana qayıtmayacağam. Çünki Benyaminin həbs olunması xəbərini atamız Yaquba (ə) xəbər vermək mənimçün çox çətindir. Hər kəsin ixtiyarı öz əlindədir və mən burada qalmaq üçün qəti qərara gəlmişəm. Vətənə qayıtmağım üçün ya gərək atam izin verə və ya (Allah-təala özü mənə kömək ola.(٢

Allah-təala onun bu iki yaxşı əməlinin əvəzini bu dünyada ona nəsib etdi və peyğəmbərlik nurunu onun nəslində bərqərar etdi.(٣) Həzrət Musa ibn İmran (ə) üç (vasitə ilə onun övladlarındandır.(۴



---

.Yusif surəsindən götürülmüşdür, ٩-١٠-cu ayə [١٨]-١

.Həmin ayə-٧٩ [١٩]-٢

.Bürhan təfsirindən çıxarış, c. ٢, səh. ٢٧٠, hədis ١٢ [٢٠]-٣

.Nəzhətul-məcalis, c. ١, səh. ١١١ [٢١]-۴

Bəni-İsrail tayfasında çox ağıllı və ədəbli bir cavan varmış. Bu cavan oğlan ata-anasına hədsiz hörmət edər və onların sözündən heç vaxt çıxmazdı. O, valideynlərinin icazəsi .olmadan bir iş görməzdi

Günlərin birində həmin cavan oğlan bir miqdar mal alır və aldığı malların pulunu vermək üçün evə getməli olur. O, içərisinə pul qoyduğu sandıqçanın açarını axtarır. Təsadüfdən atası açarı ciibnə və paltarları da başı altına qoyub yatmışdı. Oğlanın atasını oyatmağa ürəyi gəlmədi. Atasının yanında oturdu ki, bəlkə o yuxudan ayıla. .Amma kişi çox yorğun olduğundan ağır yuxuya getmişdi

Oğlanın mal aldığı adam hava qaralmamış öz vilayətinə qayıtmalı idi. O səbəbdən də çox gözləyə bilməzdi. Oğlan sandıqçanın açarını götürmək üçün atasını oyatmadı və .aldığı malı sahibinə geri qaytarıb üzrxahlıq etdi

Atası yuxudan ayılandan sonra oğlundan soruşdu: "Oğlum, bu günkü alış-verişin necə ?olub? Bir-şey qazana bilmisənmi

Cavan oğlan almaq istədiyi mal barədə atasına danışıb dedi: "Əgər açar sizin başınız ".altında olmasaydı və həmin malları alsaydım çoxlu mənfəət əldə edərdim

Atası oğlunun bu işinə görə çox sevindi. Dedi: "Ey əziz oğul! Bu gün əlindən çıxan həmin gəlirin əvəzində öz inəyimi sənə bağışlayıram. Bununla da bu gün əldən qaçırdığın ".fürsətin əvəzini gələcəkdə əldə edəcəyinə ümidvaram

Bu əhvalatdan bir müddət keçəndən sonra oğlanın atası öldü. O vaxtlar Bəni-İsrail tayfasından bir nəfəri öldürmüşdülər. Camaat qatilin kim olduğunu bilmək

üçün həzrət Musanın (ə) yanına gedirlər. Musa (ə) onlara deyir: “Əgər qatilin kim olduğunu bilmək istəyirsinizsə, bu nişanələri olan inəyi alıb kəsin. Həmin inəyin quyruğunu ölən adama vursanız dirilər və qatilin kim olduğunu deyər.

Həzrət Musanın (ə) dediyi bütün nişanələr ancaq bu cavan oğlanın inəyinə aid idi. Bəni-İsrail tayfası inəyi almaq üçün oğlanın yanına gedirlər. Anası oğluna deyir: Bəni-İsrail tayfasına de ki, inəyi almaq istəyirlərsə, gərək onun dərisini soyub içərisini qızıl sikkələrlə doldurub təhvil versinlər.

Onlar oğlanın qoyduğu şərt ilə razılaşmağa məcbur olduqlarından inəyin dərisini qızılla doldurub oğlana verdilər.(۱)

Valideynlərinə etdiyi hörmət və yaxşılığın əvəzində Allah-təala ona belə böyük bir sərvət əta etdi. Həmçinin Qur`anın ən böyük surəsi həmin inəyin əhvalatına görə Bəqərə (yə`ni inək) adlanmış və Allah-təala bu surədə həmin əhvalata işarə etmişdir.

### ATAYA XİDMƏTİN MÜKAFATI

Nəql olunur ki, bir kişinin dörd oğlu var idi. Oğlanların atası ağır xəstə idi. Oğlanlardan biri o biri qardaşlarının yanına gedib dedi: “Mənim belə bir şərtim var: Ya siz atama baxın və ölümündən sonra mirasdan əl çəkin və ya mən özüm ona baxıb, mirasdan imtina edirəm.“



---

۱- [۲۲] Bəqərə surəsindən götürülmüşdür, ۶۷-۷۲-ci ayə. Məcməul-bəyan təfsiri, c. ۱, səh. ۱۳۷. burhan təfsiri, c. ۱, səh. ۱۱۱.

Qardaşlar ona dedilər: “Yaxşısı budur ki, sən atamıza qulluq edəsən. Həmçinin ölümündən sonra sənə düşəcək mirasdan imtina edəsən. Oğlan razılaşıb atasını öz evinə apardı. Bir müddətdən sonra atası dünyasını dəyişdi. Günlərin birində bu oğlan atasını yuxuda görür. Atası ona deyir: Ey əziz oğlum! Filan yerdə bir dinar qoymuşam. Get onu götür və ehtiyacın olan şeyə xərclə. Allah-təalanın o bir dinara çoxlu bərəkət verəcəyinə və beləliklə də sənin var-dövlət sahibi olacağına ümidvaram. Bu vasitə ilə də mənimçün çəkdiyin zəhmətin bəhrəsini görərsən. Oğlan soruşdu: “Məgər o bir ?dinarda nə bərəkət var

.Bəli, bu bir dinarın bərəkəti çoxdur”– deyə atası cavab verdi“

Oğlan yuxudan ayılandan sonra atasının qoyduğu bir dinarı götürüb bazara yollandı. Bazarda qarşısına bir balıq satan çıxır. O, əlində tutmuş iki balığı göstərərək müştəri səsləyirdi. Oğlan yaxınlaşıb balıqların qiymətini soruşdu. Balıqsatan dedi: “İkisini bir dinara satıram. O həmin bir dinarı verib, balıqların ikisini də aldı. Balıqların içindən iki dənə cəvahir çıxdı. O, beləsini heç yerdə görməmişdi. Bu xəbər padşahın qulağına çatanda onları çox baha qiymətə oğlandan aldı. Beləliklə də oğlan dövrünün tanınmış (var-dövlət sahiblərindən oldu.(١



---

.Xəzinətul-cəvahir kitabından ixtisarla, səh. ۶۲۱, hekayə-۴۲ [۲۳] -۱

Dövrümüzün sufi şairlərindən olan Mün’im Ərdəbili valideynlərə münasibətin hansı nəticələr doğurduğunu nəzmə çəkmişdir:

Aqvalideynə dünya tufandı, Allah, Allah!

Dünyavü-axirətdə veylandı, Allah, Allah!

Vurmuşdu valideyni bir şəxsi-bimürüvvət

Dünyadə fəqr odunda odlandı, Allah, Allah!

İncitmə valideyni, axır zəlil olarsan

Aqvalideynə dünya zindandı, Allah, Allah!

Nifrin edəndə valid, amin deyər muhasen

İzzət yolu ol şəxsə bağlandı, Allah, Allah!

Öp əllərindən indi, qəbrin daşından öpmə

Beş gün sənin evində mehmandı, Allah, Allah!

Pul ver, məhəbbət eylə, mehmandı xidmət eylə

Bir gün baxıb görərsən, üryandı, Allah, Allah!

Düş, öp ayaqlarından versin duai-xeyri

Dərdə həmin dualar dərmandı Allah, Allah!

Bir şəxsin altı oğlu getdi biri dayandı

Çox-çox böyük məqamə qovzandı, Allah, Allah!

İndi həmin cavanın sərvət yağır başından

İqbalı, təxtü-bəxti tabandı, Allah, Allah!

Aləmdə sərvətilə xoşbəxt olammaz insan

Şərti-rizayi madər rizvandı, Allah, Allah!

Hər evdə nığ-nığ olsa, cəncalü-şurü-qoğa

Axırı ol dudmanın virandı, Allah, Allah!

Hər evdə ki səfa var, ya mehü ya vəfa var

Ey xoş ol dudmana ki, xəndandı, Allah, Allah!

səh:۵۱

## UŞAQLAR VƏ HEYVANLARA MÜNASİBƏT HAQQINDA

### !BİDARİ ƏLİ BAŞ

:Əllamə Təbatəbai belə nəql edir

.Kiçik yaşlarımda olarkən Təbrizdə çox qəribə bir əhvalat baş vermişdi

Təbriz şəhərində "Bidar Əli" adlı bir dərviş yaşayırdı. Bu buğdayı rəngli, arıq cüssəli dərvişin əlində həmişə bir təbərzin olardı. Onun Bidar Əli adlı kiçik bir oğlu da var idi. Bu dərviş ara-sıra iştirak etdiyi rozə məclis-lərində təbərzinini göyə qaldırıb camaata :deyərdi

Bidari Əli baş!" (Əlidən qafil olma) Mən özüm dəfələrlə onu belə məclislərdə" .görmüşdüm

Bir axşam Bidar Əlinin uzaq kəndlərin birində yaşayan dostlarından biri onun evinə qonaq gəlir. Bidar Əlinin arvadı qonağı layiqincə qarşılayır. Dostu həmin axşam onu çox gözləyir. Amma Bidar Əli gəlib çıxmır. Qonağın getməyə bir yeri olmadığı üçün gecə onun bir otağlı evində qalmalı olur. Qonaq üçün yataq sərilmiş otağın bir küncündə Bidar Əlinin balaca oğlu yatmışdı. Ev sahibinin arvadı uşağı yuxudan oyatmaq istəmədiyi üçün həmin gecə balaca Bidar Əli qonaqla bir otaqda yatır. Qadın .evdə tək olduğu üçün qonaqdan ehtiyat edib otağın qapısını arxadan qıfıllayır

Gecənin bir aləmində qonaq ayaq yoluna getmək üçün yuxudan ayılır. Əl atır qapını açsın, görür ki, qapı arxa tərəfdən bağlıdır. Nə qədər qapını döyüb çığırsa da, gəlib qapını açan olmur. Eyvanda yatmış qadın qonağın pis niyyəti olmasından xoflanıb özünü yatmışlığa vurur. Bir tərəfdən də qonaq artıq özünü saxlaya bilmirdi. Öz-özünə fikirləşir ki, neyləyim, necə eləyim? Birdən ağlına belə bir fikir gəlir: Uşağı öz yerimə qoyum və mən də

onun yerində yatıb xarablıq edərəm. Səhər açılanda da ev sahibi elə biləcək ki, uşaq .yerini isladıb

O, bu cür də edir. Amma uşağı öz yatağına qoyan kimi uşaq onun yerini tamamilə batırır. Qonaq uşağın yerində uzanır. Amma xəcalətindən səhərəcən gözünə yuxu getmir. Çünki, səhər ev sahibi onun yatağını bu vəziyyətdə görəndə nə deyəcəkdi? Axı mən bunu onlara necə başa salacağam? Qaş düzəldən yerdə vurub gözünü də .çıxartmışdım

Sübh azanında ev sahibinin arvadı qonaq yatan otağın qapısını açır ki, dəstəmaz almaq üçün çölə çıxsın. Qonaq xəcalətindən başını aşağı salıb sağollaşmadan evdən .gedir

Həmin şəxs Təbriz şəhərində olarkən çalışırdı ki, Bidar Əli ilə heç vaxt üz-üzə gəlməsin. Elə buna görə də küçə və bazarda uzaqdan Bidar Əlini görər-görməz tez bir küncə .çəkilib gizlənərdi

Amma iş elə gətirdi ki, bir gün bazarda Bidar Əli ilə rastlaşır. Onun gözündən yayınıb :gizlənmək istəyəndə Bidar Əli dostuna deyir

Ay gədə! O gecə nə hadisə baş vermişdi, məni başa sal." Qonaq utanaraq deyir: "And" olsun Allaha, mən heç nə eləməmişdim." Sonra həmin gecə başına gələnləri Bidar .Əliyə danışır

Bu çox ibrətamiz bir əhvalatdır. Burada demək istəyir ki, günahını başqasının boynuna atmaq istəyən hər bir kəsi Allah-təala daha da pisinə mübtəla edər. Hər bir şəxs üçün abır-həya əhəmiyyətli olduğu kimi, başqalarının da abır həyası özləri üçün qiymətlidir. Heç kim öz mənafeyinə görə başqasının abır-həyasını apara bilməz. Hətta həmin şəxs .kiçik yaşlı bir uşaq olsa belə

Bunu da yaddan çıxarmamalıyıq ki, bizim bütün əməllərimizə nəzarət edən Allah-təala, hər hansı bir pis əməlimizi də cavabsız qoymayacaqdır.(١)

"Şübhəsiz ki, Rəbibn (bəndələrinin bütün əməllərini) baxıb görür."(٢)

## BƏ`Zİ BƏLALARIN SƏBƏBİ

Son dövrün tanınmış ariflərindən olan Şeyx Rəcəbəli Xəyyat haqqında qəribə əhvalatlar nəql edib deyirlər ki, şeyx insanın başına gələn hər müsibətin məna aləmində səbəbini görə bilirmiş. Şeyxin şagirdlərindən biri aşağıdakı əhvalatı bu şəkildə nəql edir:

Bir nəfərin başı zərbədən yarılmışdı. Onu Şeyxin yanına gətirirlər ki, baxıb görsün nə iş tutub ki, bu günə düşüb. Şeyx ani sükutdan sonra deyir: "İşlədiyin zavodda bir uşağa əziyyət etmisən. Əgər uşağın könlünü almasan başına hələ çox müsibət gələcək."

Başı yarılmış adam Şeyxin sözlərini təsdiqləyib deyir: "Sahə rəisinin oğlu gəlib mənə yersiz irad tutdu, mən da acıqlanıb ona dedim ki, burnunu hər yerə soxmasın.

Axşam maaşı almağa gedəndə həmin uşaq gözümə sataşdı. Günorta baş verən əhvalat yadıma düşdü, bərk dilxor oldum. Əsəbiləşib yersiz yerə uşağa bir-iki ilişdirdim, o yazıq da ağladı."

Şeyx dedi: "Boş yerə sizin başınıza bəla gəlmir. Get, nə qədər ki, bundan betərinə düçar olmamısan uşaqdan halallıq al."



---

١- [٢۴] "Mehri-taban", Əllamə Hüseyn Hüseyni (Tehrani), səh. ٩۶.

٢- [٢۵] "Fəcr" surəsinin ١۴-cü ayəsinə iqtibas olunmuşdur.

Həmçinin, Şeyxin yaxın dostlarından biri nəql edib deyir: "İki yaşlı uşağım özünü saxlaya bilməyib xalçanın üstünə batırmışdı. Anası əsəbiləşib bunun üstündə uşağa necə bir sillə çəkdisə, az qaldı körpənin nəfəsi kəsilsin. Bir saat sonra yoldaşımın qızdırması qalxdı. Get-gedə halı pisləşməyə başladı. Sabahısı, axşam çağı Şeyxi öz maşınımla yas məclisinə aparırdım. Yoldaşım da maşında idi. Yol əsnasında Şeyxə dedim: "Cənab Şeyx! Dünənnən yoldaşımın qızdırması qalxıb, hələ də düşmür".

Şeyx dedi: "Olar da! Uşağı o cür vurmazlar ki! İstiğfar et, uşağa bir şey al apar, bəlkə könlünü ələ ala bildin".

Şeyx deyən kimi etdik, dərhal qızdırma kəsildi." (١)

### HEYVANLARA ZÜLMÜN AQİBƏTİ

Bu bəhsə daxil olmazdan öncə mühüm bir məsələni oxucuların nəzərinə çatdırmaq istərdik.

Bir çoxlarının fikrincə yalnız insanlara zülm etmək günah sayılır və bu məsələnin heyvanlara aidiyyəti yoxdur. Əslində bu çox yanlış bir fikirdir. Çünki hər hansı bir heyvana zülm etmək günah olub həm bu dünyada və həm də axirətdə cəzası vardır.



---

١- [٢۶] Məhəmməd Reyşəhri. "İxlas mücəəssəməsi", səh, ۶۴.

İnsan və heyvan arasında olan fərq bundan ibarətdir ki, əgər bir insana zülm edilmiş olsa, həmin şəxs lazımı yerlərə şikayət edib öz haqqını tələb edə bilər və yaxud kiməsə .dərdini danışar. Heç olmasa da qışqır-bağır salıb ürəyini boşaldar

Amma heyvanlarda bu cür deyil. Onların danışmağa və şikayət etməyə dilləri yoxdur. Bə`ziləri hətta özlərini müdafiə belə edə bilmirlər. Heyvanlara əzab verməyin günahı heç də insanlara edilən zülmün günahından az deyil. Çünki onların hər ikisini Allah xəlq etmiş və hər ikisi də canlıdır. İnsanlarda olduğu kimi heyvanlarda da hissiyyat var. .Onlara əzab verəndə ağrını-acını hiss edirlər

İnsanla heyvan arasındakı başqa bir fərq də bundan ibarətdir ki, əgər bir insan başqasına zülm edibsə, ola bilsin ki, bir gün peşiman olub tövbə edə və həmin .adamdan razılıq ala

Amma heyvanlara azar-əziyyət edən şəxs onların razılığını necə ala bilər? Heyvanlara zülm edən şəxs həm bu dünyada və həm də axirətdə öz əməlinin cəzasını alacaqdır. Allah-təalanın əmrilə qiyamət günü heyvanlar da dirilib onlara zülm edən şəxsdən .şikayət edəcəklər

Kiçik yaşlarımdan yadıma gəlir ki, anamın ev heyvanlarını saxlamağa xüsusi rəğbəti vardı. Amma atam buna həmişə e`tiraz edərdi. Buna baxmayaraq anamın tə`kidiylə atam ev heyvanlarından bir neçə ədəd bülbül, qənari, cücə və bir də balaca pişik balasını saxlamağa razılıq verdi. Bu pişik balası çox qəşəng və sevimli idi. Mimini (həmin pişik balası) ilk dəfə görən hər kəsin ondan xoşu gəlirdi. Hətta dəfələrlə onu satmağı bizə təklif etmişdilər. Amma atam bu təklifə öz e`tirazını bildirmişdi. Çünki bu .balaca pişik balası daha çox atamla ünsiyyət bağlamışdı

Mimi atamın işdən evə qayıtmasına bir-neçə dəqiqə qalmış hasarın üstündə oturar, sanki sevimli sahibinin gəlişini hiss edərdi. Atam həyət qapısına çatar-çatmaz Mimi tez özünü onun qucağına atardı. İcarə etdiyimiz ev sahibinin Turac adlı bir oğlu var idi. İki .məsələyə görə Turacın öhdəsindən gələ bilmirdik

Birincisi bu idi ki, Turac idmançı, uca boylu və qaşqabaqlı bir cavan idi. Əgər bir yumruğuyla vursaydı, atamı yerə sərərdi. Digər tərəfdən də əgər ev sahibinin oğlundan şikayət etsəydik, artıq bu evdə qala bilməzdik. Bu evin aylıq kirayəsi az olduğuna görə məcburiyyətdən bütün bunlara güzəştə getməliydik. Elə bu səbəbə .görə atam çox vaxt Turacın kobud hərəkətlərinin qarşısında sükut edirdi

Bir dəfə atam işə gedəndən sonra Turac əylənmək məqsədilə balaca pişik balasına möhkəm bir təpik vurdu. Turacın zərbəsindən zavallı pişiyin ayağı sındı və təqribən bir .aya yaxın gəzə bilmədi

Axşam ata evə qayıdarkən həmişəki adəti üzrə pişik balasını hasarın üstündə görməyəndə çox narahat olur. Baş verənləri anamın dilindən eşidəndə Mimini qucaqlayıb ağlaya-ağlaya ev sahibinin qapısını döydü. Elə ata-anasının yanındaca üzünü Turaca tutub dedi: “Sən çox murdar heyvansan. Heyif ki, mənim sənə gücüm çatmır. Amma Allahdan istəyirəm ki, bu yazıq pişiyin başına açdığın müsibəti sənin öz ”.başına gətirsin

Turac atamı ələ salaraq dedi: “Deyirlər, qara pişiyin duasıyla yağış yağmaz.” Artıq atam Turacın üzünü belə görmək istəmirdi. Buna görə də bu evdən köçüb getməyimizi qərara aldıq. Səhər tezdən artıq biz əşyaları toplayırdıq. Turac gülə-gülə motorsikletinə minib getdi. Bir neçə saat sonra əşyalarımızı daşımaq üçün sifariş etdiyimiz yük maşını qapıda dayandı. Elə bu vaxt çalınan

qəfil telefon zəngindən sonra Turacın ata-anası ağlaya-ağlaya evdən çıxdılar. Atam da onlarla birlikdə getdi. Bir-neçə saat sonra atam, Turac və onun ata-anasıyla birlikdə evə qayıtdı. Amma Turacın bir ayağını dizdən yuxarıya qədər gipsə salınmış :görəndə çox təəccübləndik. Atam dedi

Turac səhər motorsikletinə minib gedərkən yolda bir maşınla toqquşur. Maşındakı“ dörd sərnişin onu o qədər vururlar ki, bir ayağı əməlli-başlı sınır və xəstəxanaya aparıb .ayağını gipsə salırlar

Həmin günün səhəri yığışıb getmək istəyəndə, Turac və ata-anası bu evdə qalmağımızı xahiş etdilər. Çünki Turac deyirdi: “Zavallı pişiyin başına açdığım müsibətə görə Allah-təala bu bəlanı mənim başıma gətirdi. Əgər siz bu evdən köçüb getsəniz və ”.mənə nifrin etsəniz, Allah bilir başıma daha nələr gələcək

Bəlkə də inanmayacaqsınız, amma pişiyin ayağı sağalandan bir gün sonra Turacın da (ayağının gipsini açdılar.(١

### İTİ DƏ ALLAH YARATMIŞDIR

:Əsrimizin böyük ariflərindən olmuş Cəfər Ağa Müctəhidi (Təbrizi) belə nəql edir

Günlərin bir günü, sübh azanından bir qədər keçmiş Həzrət İmam Rza (ə) tərəfindən inayət olunmuş bir cazibə məni evdən çölə doğru çəkdi. Çölə çıxıb məni çəkən cazibənin istiqamətində hərəkət etməyə başladım. Xiyabanı keçib “Həzrəti” adlanan meydana çatanda hiss etdim ki, artıq hərəkət etməyə qadir deyiləm. Sanki



---

.Günahkarların aqibəti”, Seyyid Cavad Rəzəvi, səh. ١١٢“ [٢٧] -١

ayaqlarımı yerə mıxlamışdılar, irəliyə addım ata bilmirdim! Batinimdə bir səs mənə .deyirdi ki, burada durub bir səhnəni müşahidə etməlisən

.Gördüm qoca bir it hərəmin günbəzinə tərəf boylanıb nalə edir

Bu hadisədən yarım saat keçmiş gördüm ki, bahalı bir maşın meydanın kənarında dayandı. Maşının arxa qapısından əyin-başından varlı təbəqədən olduğu bəlli olan bir şəxs düşüb itə tərəf getdi. İtin gözü həmin şəxsə sataşar-sataşmaz quyruğunu .bulamağa başladı

Bu səhnəni görüb riqqətə gəldim. Hiss etdim ki, əvvəlki halətim dəyişildi və artıq hərəkət edə bilirəm. Həmin şəxsə tərəf gedib salam verdim. Pərişan və narahat .olduğu qiyafəsindən aydın gözə çarpırdı

.Soruşdum:–Bu itin əhvalatı nədir belə? Deyəsən sizi tanıyır

Kişi dərin bir ah çəkib dedi: Bu iti küçük ikən arvadımın təklifi ilə evə gətirdim. Yaxşı bəslədiyimiz üçün az bir vaxtda böyüdü. Tədricən həyət-baxçanın, qapı-bacanın gözətçisinə çevrildi. İllər keçdi, o qocaldı. Qocaldığı üçün artıq keşik çəkməyə halı qalmamışdı. Axırı, dünən gecə arvadım iki ayağını bir başmağa dirəyib dedi: Artıq bu it işimizə yaramır, apar onu bir yerdə azdır, qayıt! Gərək başqa bir it tapıb gətirək. Bu !boyda həyət-bacanı itsiz qoymaq olmaz

.Sürücümə dedim iti özü ilə aparıb Məşhədin ətrafında bir yerdə azdırsın

Sürücü iti maşına oturdub getdi. Bir saatdan sonra qayıdıb dedi: Yaman vəfalı heyvan imiş. İti Vəkilabadın ətrafında maşından düşürəndə yalvarıcı baxışlarını mənə zilləmişdi. Sanki mənim belə bir iş görəcəyimi gözləmirdi. Yola düşüb qayıdanda bir .qədər maşının ardınca yüyürdü, amma sonra yorulub dayandı

Təqribən gecə yarısı yuxuya getdim... Yuxuda qiyafəsindən cah-cəlal yağan bir – seyyidi gördüm. Onun heybətli görkəmini görəndə bir anlığa duruxdum. Seyyid amiranə bir səslə mənə dedi: Sizin insanlığınız harada qaldı?! Niyə bu dilsiz ağızsız heyvana rəhm etmədiniz. Məgər siz qocal-mayacaqsınız?! Sizi qoca vaxtınızda ev eşiyinizdən məhrum edib çölə atsalar xoşunuz gələrmi? Gəlin onu aparın, onun gözü !hələ də yoldadır

.Bu anda hövlanak yuxudan qalxdım...

Ürəyim şiddətlə döyünür, ağır-ağır nəfəs alırdım. Dilim-dodağım qurumuşdu. Başımda küt bir ağrı hiss etdim. Qalxıb bir az gəzişdim; su içib yenidən yatağa uzandım. Yavaş-yavaş təbii halım özümə qayıtdı. Amma yuxuda gördüyüm səhnə hələ də məni narahat edirdi. Əsəblərimi tam ələ alandan sonra ürəyimdə dedim: Narahat olmağına dəyməz, bütün bunlar bir xəyaldır, adi bir yuxudur, başını at, yat! Qoca bir itin nə dəyəri var ki, .bu qədər onun üstündə baş sındırırsan

Elə ki, yuxuya daldım, yenidən həmin səhnə təkrarlandı. Bu dəfə həmin seyyid məni !?danlayaraq dedi: Daha niyə məəttəlsən, niyə özünə gəlmirsən

Yuxudan dik atıldım. Lə`nət şeytana - deyib öz-özümə dedim: Niyə bu fikirlər mənim… başımdın çıxmır. Bu gecə niyə bu qədər uğursuz və uzundur belə, elə bil səhər açılmaq .istəmir

Yuxu dərmanı atıb yenidən yerimə uzandım. Yuxuya dalar-dalmaz, üçüncü dəfə yenə həmin səhnə təkrar oldu. Amma bu dəfə həmin seyyid acıqlı bir ifadə ilə mənə dediklərini təkrarladı. Özümü itirmiş halda soruşdum: Axı mən bu böyüklükdə şəhərdə !iti harada axtarım? Dedi: Şəhərin yuxarı meydanına gedin, it orada sizi gözləyir

Yuxudan qalxanda artıq əvvəlki iztirabım çəkilib getmişdi. Tez libasımı geyinib sürücünü səslədim. Ürəyimdə dedim: Gedib yoxlamağına dəyər. Axırı it ya orada olacaq, ya da olmayacaq. Əgər it orada olsa özümlə evə gətirəcəm, yox, əgər olmadı, ən azı fikrim rahat olar. Bilərəm ki, yuxuda gördüklərim qarabasmadan başqa bir şey .deyilmiş

İndi budur, gəlmişəm, görürəm ki, bu vəfalı it burada dayanıb mənə quyruq bulayır. Sanki mənə demək istəyir ki, bizim də Allahımız var! Siz bizi yaddan çıxarsanız da Allah !bizi yaddan çıxarmır. Hər nə olsaq da Onun yaratdıqlarıyıq

Həzrət Ağa Müctəhidi bu xatirəni danışandan sonra buyurdu: İmamın işlək əli bu (aləmdə iş görür, bu əli görən göz lazımdır.(١



---

.Mücahidi Məhəmmədəli, “Dər məhzəre lahutiyan”, c. ١, səh. ١۵١ [٢٨] -١

Bu aləmdə hər bir varlıq Allahın yaratdığı olmaqdan əlavə, həm də yaradılış sistemində .ifa etdiyi rola görə ehtirama layiqdir. Heç bir varlığa həqarət gözü ilə baxmamalıyıq

Rəhmətlik Ayətulllahul-Üzma Seyyid Məhəmməd Hadi Milani bu məsələnin təsdiqində deyirdi: Qur`ani-kərimin kəlmələrinə dəstəmazsız toxunmağa haqqımız yoxdur. Fərqi yoxdur, istər "insan" kəlməsi olsun, ya "kəlb" (it) və ya "nəml" (qarışqa). Allahın yaratdığı olduqları üçün hər biri hörmətə layiqdirlər. Onların hər birinin hörmətinə tələb .olunan həddə riayət edilməlidir

Bir qarışqa olsa belə incitmə sən düşün bir

.Canı vardır onun da, can hər kəsə şirindir

Hərdən biz insanlar bir problemlə üzləşdiyimiz zaman, vəziyyyəti çıxılmaz görəndə hər qapıya üz tuturuq. Amma Allah dərgahına üz tutmaq, mə`sumlara təvəssül etmək yadımızdan çıxır. Sanki qəflətə düçar oluruq. Bu qəbildən olan hekayələrin yad .edilməsi bizi canımıza çökmüş qəflətdən ayılda bilər

Əgər biz Allahın yaratdıqlarının xidmətlərindən bəhrələniriksə, bu xidmətləri .dəyərləndirib qarşılığını ödəməliyik

## CƏZASI ÇOX ÇƏKMƏDİ

:Bəhlul” Əfqanıstanda olarkən şahidi olduğu bir hadisəni belə nəql edir“

Əfqanıstanda belə bir adət var idi ki, cümələr və əlamətdar günlərdə camaat bir yerə“ yığışıb xoruz və kəkliklərin döyüşməsinə tamaşa edərdilər. (Əlbəttə bu qadağan olunmuş bir iş idi. Əgər polis onları görsəydi camaatı oradan uzaqlaşdırar və xoruz (.döyüşdürənləri də tutub apardı

Deyir: Bir gün küçədən keçərkən polisin cavan bir oğlanla kəklik üstündə mübahisə :etdiyini gördüm. Polis oğlana deyirdi

Sən bu kəkliyi döyüşdürmək üçün saxlayırsan. Mənə rüşvət verməsən kəkliyi səndən“ .alacağam

Cavan oğlan isə deyirdi: “Mən bu quşu döyüşdürmək üçün deyil, oxuduğuna görə .saxlayıram. Nə vaxt bu quşu döyüşdürdüyümü görsən, onda mane ola bilərsən

Polis əsəbiləşib oğlanın əlindəki kəkliyin başını bədənindən ayırıb küçənin ortasına atır. :Sonra polis üzünü cavan oğlana tutub deyir

”.İndi hara və kimə istəsən gedib məndən şikayət edə bilərsən“

O, bədbəxt hələ əlli addım oradan uzaqlaşmamışdı ki, böyük bir maşın arxadan onu vurub asfalta döşədi və üstündən keçib getdi. Polisin bədəni həmin kəkliyin

bədəni kimi iki yerə bölündü. Başı ilə əlləri bir tərəfə, bədəni ilə ayaqları isə başqa bir tərəfə düşdü.(۱)

### AYAĞI KƏSİLDİ

Əmr ibn Əbduvəd dövrünün qorxmaz və şücaətli döyüşçülərindən biri idi. O, Peyğəmbəri (s) öldürmək və İslam dinini aradan aparmaq üçün Məkkə və ətraf şəhərlərdən minlərlə silahlı döyüşçü toplayıb Mədinəyə hücum etdi. Amma müsəlmanların Mədinə şəhərinin ətrafında qazdıqları dərin xəndəklər onların şəhərə girişlərinə mane oldu. Əbu Süfyanın qoşunu şəhər kənarında çadır qurmağa məcbur oldu və onlar bir aya yaxın orada qaldılar.

Bir gün Əmr atına minib, müsəlman qoşununun önündə rəcəz oxuyaraq döyüşə hərif çağırırdı. Peyğəmbər (s) üç dəfə öz səhabələrinə buyurdu: "Sizlərdən biri gedib onun cavabını versin." Əlidən (ə) başqa heç kim dillənmədi.

Peyğəmbər (s) Əlini (ə) Əmr ilə döyüşməyə göndərdi. Həzrət Əli (ə) onunla üz-üzə dayanıb dedi: "Sənə üç təklifim var: Onlardan birini qəbul edə bilərsən.

۱-Birinci təklifim budur ki, bütpərəstlikdən əl çəkib İslam dinini qəbul edəsən.

Əmr dedi: Mən İslamı qəbul edən idimsə bu gün sizinlə döyüşə gəlməzdim.



---

۱- [۲۹] Bəhlulun siyasi xatirələrindən götürülmüşdür, səh. ۲۶۵.

İkinci təklifim budur ki, döyüşdən vaz keçib Məkkəyə qayıdasan və müsəlmanları-۲ .rahat buraxasan

Dedi: Bu təklif deyil, amma nəticəsi bu olacaq ki, hətta qoca qarılar belə bir-birinə deyəcək: Əmr Peyğəmbər (s) və Əli (ə) ilə döyüşməkdən qorxub, zillət içində Məkkəyə .qayıtdı

Əli (ə) buyurdu: “Bu şücaətinlə sən atlısan, mən isə piyada. Atdan yerə en və gəl-۳ .döyüşək

İmamın sözü Əmrə çox pis tə`sir etdiyindən dərhal atdan endi. Təkəbbüründən vurub atın ayaqlarını qılınc ilə kəsdi. Amma bu əməlinə görə bir neçə dəqiqə sonra .cəzalanacağını heç ağlına belə gətirməzdi

Əli (ə) ikinci dəfə ona hücum edəndə qılıncla vurub Əmrin ayağını kəsdi. Əmr ağır daş .parçası kimi yerə yıxıldı

Bə`zən zalım şəxs neçə ay və ya neçə il sonra öz pis əməlinin cəzasını alır. Amma Əmr bir-neçə dəqiqə ərzində öz cəzasına çatdı. Əgər o atının əl-ayağını kəsməsəydi, bəlkə .də Həzrət Əli (ə) onun ayağını kəsməzdi

(Amma Allah-təalanın hökmünə əsasən hər əməlin cəzası həmin miqdarda olmalıdır.(۱

səh:۶۶

---

Biharül-ənvardan götürülmüşdür, c. ۱, səh. ۲۲۶. ibn Əbil Hədid, Nəhcül-Bəlağənin [۳۰] -۱ .şərhi, c. ۱۹, səh. ۶۴

## ZÜLM VƏ ƏMƏLLƏRİN CƏZASI HAQQINDA

### BAŞQASINA QUYU QAZDI, AMMA ÖZÜ DÜŞDÜ

Bəhlul ləqəbi ilə şöhrət tapmış Şeyx Məhəmməd Təqi əsrimizin nadir şəxsiyyətlərindən biri olmuşdur. Uzun ömür sürmüş Bəhlulun macəra ilə dolu məşəqqətli, eyni zamanda .bərəkətli həyatına nəzər salanda insan təəccübünü gizlədə bilmir

Böyük alim, ədib, kəramət sahibi olmuş Bəhlul eyni zamanda haqq uğrunda mübarizə aparan bir mücahid idi. Həyatını bütünlüklə İslamın tərəqqisi uğrunda mübarizəyə həsr edən Bəhlul zalım şah rejiminə qarşı apardığı mübarizələrə görə tə`qiblərə mə`ruz qalmış, ömrünün müəyyən hissəsini mühacirətdə keçirmişdir. Əfqanıstanda dövlət mə`murları tərəfindən yaxalanan Bəhlul otuz bir il müddətinə Əfqanıstanın müxtəlif zindanlarında məhbus həyatı yaşamış, zindandan çıxdıqdan sonra isə Əfqanıstanın ucqar kəndlərindən birinə sürgün edilmişdir. Zahidanə həyat sürmüş (.Bəhlul ۲۰۰۵-ci ilin yayında, ۱۱۴ yaşında vəfat etmişdir. (Allah rəhmət eləsin

illik zindan həyatını xatırlayan Bəhlul başına gəlmiş qəribə əhvalatlardan birini belə ۳۱ :nəql edir

Əfqanıstanda zindanda olduğum illərdə xəstə məhbuslara, uşaqlara baxmağı öz öhdəmə götürmüşdüm. Bu işdən əlavə şəhərin icra hakimiyyətinin razılığı ilə zindanda dərs də verirdim. (Bəhlul ictihad dərəcəsi kəsb etmiş alim idi.) Otuz qırx nəfərə yaxın məhbus günün müxtəlif saatlarında yanıma yığışıb dərs oxuyurdular. Cəlalabad (Əfqanıstanın böyük şəhərlərindən biridir) şəhərinin yuxarı təbəqədən olan bə`zi şəxsləri icra hakimi

və ya zindanın rəisi ilə tanışlıqları olduğu üçün danışıb icazə almışdılar ki, öz uşaqlarını .dərs oxumaq üçün zindana mənim yanıma göndərsinlər

Zindana gəldiyim ilk günlərdən zindanın bə`zi təəssübkeş mə`murları şiə olduğum üçün məni incidirdilər. Onların məni görməyə gözləri yox idi. Bu səbəbdən də icra hakiminin mənə olan ehtiramını, böyüklərin öz uşaqlarını mənim yanıma dərs oxumağa göndərmələrini görəndə çox narahat olurdular. Bir yolla məni aradan .götürmək istəyirdilər

Məhbuslardan biri zindanda balaca dükan kimi bir yer götürüb zəruri ərzaq məhsulları satmaqla məşğul olurdu. Bu adam dövlət yanında e`tibarlı zəmanət qoyaraq hərdən əsgərlərlə birlikdə çölə çıxış icazəsi almışdı. O , bir-iki əsgərin müşayiəti ilə çölə, bazara çıxıb məhbuslara lazım olan ərzaq məhsulları və xırda-para şeylər alıb zindanda məhbuslara satırdı. Bu iş Əfqanıstan zindanlarında adi bir hal sayılırdı. Əlbəttə bu işlə məşğul olan məhbuslar icarə haqqından əlavə zindanın mə`murlarına aylıq haqq da .ödəyirdilər

Mən hər gün zindanın dükanından qatıq alırdım. (Bəhlul ömrünün doxsan ilə yaxın bir müddətini ancaq qatıq çörəklə keçinmişdi.) Mənimlə düşmənçilik edən zabitlər dükanı işlədən məhbusa təzyiqlər göstərib məcbur edirlər ki, məni bir vasitə ilə zəhərləyib .öldürsün. Bu işə görə ona çoxlu pul mükafatı da və`d etmişdilər

Bir gün mən yenə adəti üzrə dükana qatıq almağa getdim. Dükan sahibi hər gün mənə qatıq çəkib verdiyi küpədən qatığı götürmədi və dedi: Hər gün sizə satdığım bu qatıqların üzü, qaymağı alınır, bunları yeməklə canın qüvvət tapmaz. Bu gün sizə xüsusi bir kasada elə qatıq tutmuşam ki, yesən dadı damağından getməz. Qatıq

.deyil, əsil qaymaqdır. Bunu sizin üçün hazırlamışam ki, yeyib mənə dua edəsiniz

Bunu deyib keçdi dükanın arxa tərəfindən bir kasa üzü qaymaqlı qatıq gətirdi. Mən qatığı götürüb öz hücrəmə qayıtdım. Çox acdığım üçün qatığı bütöv bir fətirlə bir oturuma yeyib, kasanın diibni də barmaqlarımla təmizlədim. Bir dəqiqədən sonra .mə`dəmdə sancı, ürək bulanması hiss etdim

Dostlarım və şagirdlərim halımı belə görüb dükançının üstünə cumdular ki, dükanını dağıdıb özünü də əzişdirsinlər. Mən mane olub dedim: Tələsməyin, ola bilsin dükançı xəyanət etməsin. Bəlkə də vəbaya tutulmuşam. O vaxtlar Əfqanıstanda vəba xəstəliyi yayılmışdı. Dükançı da xəyanəti hazırlayanda hiyləsi bu olmuşdu ki, əgər, birdən .ölsəm, desin vəbadan ölmüşdür

Mən ara vermədən öyüyüb qusurdum. Xülasə, dostlarım dükançıya toxunmadılar, gedib mənim üçün həkim çağırılmasını tələb etdilər. Həkim gəlib qaytardığım qatığı yoxlayıb, qatığın zəhərli olduğunu təsdiq etdi. Zindanın rəisi mənə dedi ki, dükançını qanuni cəzalandırmaq üçün şikayət ərizəsi ilə rəsmi olaraq ona müraciət edim. Amma mən dedim: Bizim imamlarımız bizə bu cür göstəriş verməmişlər. İmam Həsəni (ə) yeddi dəfə zəhərləyib öldürməyə çalışmışlar, amma imam zəhər verənlərdən heç birini mühakiməyə çəkmədi. Dedim: Tutaq ki, mən ondan şikayət etdim, siz ona ?neyləyəcəksiniz

Allaha şükür ki, mənə bir şey olmayıb, ölməmişəm. Əgər ölmüş olsaydım belə, indi artıq İslam ölkələrində də Qur`anın hökmləri yox, Avropa qanunları icra edilir; bu qanuna görə də qatili öldürmürlər. Bir də mənim qisas tələb edəcək varisim yoxdur. Görəcəyiniz iş bu olacaq ki, onun həbs müddətini uzadacaqsınız. Onun üstündə indi

on bir il iş var. Həbsinə əlavə bir-neçə il də əlavə edilsə bu daha çox onun ailəsinin .zərərinə qurtaracaq. Mən bu işə razı deyiləm. Xülasə, mənim ondan şikayətim yoxdur

Zindanın mə`murları dükançıdan böyük məbləğdə rüşvət aldılar. Məni qətlə yetirəcəyi müqabilində ona pul boyun olmuş mə`mur da demişdi: Mənim şərtim bu olmuşdur ki, .sən o kafir axundu öldürəsən. İndi ki, ölməyib, sənə heç qara qəpik də verən deyiləm

Çox keçmədi dükançı vərəm xəstəliyinə mübtəla oldu. Bütün varını-yoxunu xəstəliyin .müalicəsinə sərf etsə də sağalmadı və həmin xəstəlikdən də öldü

O öləndən sonra arvadı və dörd kiçik qızı o qədər kasıblayıb zəiflədilər ki, imkan (düşəndə mən zindandan onlara pul, çörək və paltar göndərirdim.(١

## ZİNDAN XATİRƏSİ

:Bəhlulun zindan həyatında maraqlı əhvala-tlardan biri də belə olmuşdur

Mənim əlimdən yanıqlı olan həbsxana rəisinin müavini hər nə yolla olursa-olsun, məni .öldürmək istəyirdi

Məhbusların əksəriyyəti və bə`zi mə`murlar məni tərəfimi müdafiə etdikləri üçün bu işi zindanda görmək bir o qədər də asan deyildi. Bunun başqa bir səbəbi də



---

.Seyyid Abbas Musəvi Mütləq, “Əcubeyi Əsr”, səh. ١١٣-١١۶ [٣١] -١

zindanın ətrafında bə`zi dövlət idarələrinin yerləşməsi, ikinci səbəbi isə yuxarıda .oturanların işə qarışa biləcəkləri qorxusu idi

Həmin şəxs belə qərara gəlir ki, yeni bir zindan tikdirsin və məni oraya köçürməklə işimi orada bitirsin. Buna görə də şahla şəxsən görüşüb belə bir təklif verir ki, bizim bu zindanda səksənə yaxın siyasi məhbusumuz var. Bu zindan şəhərin ortasında yerləşdiyi üçün onların ətrafla əlaqələrinə lazımınca nəzarət etmək olmur. Bu məhbusların şəhərin içində saxlanılması məsləhətə uyğun deyil. Yaxşı olardı ki, onları .şəhərdən kənar bir yerə köçürərdik

Şah təkliflə razılaşandan sonra yeni zindanın tikilməsi üçün lazımi büdcəni ödəyir və .şəhərdən qıraqda yeni zindanın tikintisinə başlayırlar

.Bir il üç aydan sonra yeni zindan tikilib hazır olur

Mənə düşmən kəsilmiş mə`mur öz yaxın adamları ilə belə bir plan çəkirlər ki, məni yeni tikilmiş zindanda rütubətli, tək nəfərlik bir hücrəyə salsınlar və tədrici ölümümü .gözləsinlər

Yaxın əlaqəmiz olan zindan mə`murlarından biri məni məsələdən agah edir. Amma çıxış yolu yox idi. Mən nə edə bilərdim ki?... Bütün işləri Allaha tapşırıb oturub hadisənin .nə ilə qurtaracağını gözləyirdim

.Zindan hazır oldu. Siyasi məhbusları iyirmi gün sonra yeni zindana köçürməli idilər

Bu arada Kabul şəhərində böyük bir oğurluq hadisəsi baş verdi. Şahın xalası oğlunun evindən külli miqdarda

pul, cəvahirat oğurlanmışdı. Kabul şəhərinin baş polis idarəsi uzun axtarışlardan sonra oğruları tapır. İstintaq zamanı mə`lum olur ki, bu dəstənin başında məni öldürmək istəyən zindan rəisinin müavini dururmuş. Sən demə, bunlar on beş il imiş ki, oğurluqla məşğul olurmuşlar, amma dəstənin başçısının kim olduğu bilinmirmiş. Oğruların e`tirafına görə oğurlanmış mal üç yerə bölünürmüş. Bir hissəni həmin məmur .götürürmüş, qalan iki hissə isə dəstə arasında bölüşdürülürmüş

Mə`murun evində təftiş apararkən çoxlu miqdarda ləl-cəvahirat aşkarlanıb götürülür. Eyni zamanda bə`zi dövlət əhəmiyyətli sənədlər və başqalarına məxsus əşyalar tapılıb üzə çıxır. Nəticədə yeni tikilmiş zindana düşən ilk şəxs, elə həmin mə`murun özü olur. O, zindana salınandan sonra məni və digər siyasi məhbusları da yeni zindana .köçürdülər

Yeni zindanın rəisi şiə məzhəbli bir zabit idi. Mənə olduqca böyük hörmət göstərirdi. Evindən mənim üçün qatıq-çörək gətizdirər, öz otağına də`vət edib süfrəni orada .açardı

Yeni rəis, həmin kemiş mə`murun başına oyun açırdı. Onu tək nəfərlik hücrəyə salıb gəzintiyə icazə vermirdilər. Hücrəsində bir vedrədən başqa heç bir şey yox idi. Ayaqyolu kimi istifadə etdiyi bu vedrəni hər gün səhər tezdən aparıb boşaldanda işıq üzü görürdü. Ona yeddi il həbs cəzası kəsəndən sonra ümumi zindana köçürdülər. Cəzasını çəkib azadlığa çıxandan sonra da həmişəlik dövlət işlərindən məhrum edildi. Sonradan

(onu görənlər deyirdilər ki, bədbəxt mə`mur Kabul bazarında kömür satırmış.(١)

## ZALIMA TƏBRİK

:İmam Baqirin (ə) tanınmış şagirdlərindən olan Məhəmməd ibn Müslüm belə nəql edir

Günlərin birində şiələrdən bir qrupu İmam Baqirin (ə) mənzili önündə toplaşmışdılar.“ İmam Baqir (ə) dəstə-dəstə harasa tələsən camaatı görəndə ətrafındakılardan :soruşdu

”?Mədinə şəhərində nə hadisə baş verib“

Zalım Abbasi xəlifəsi tərəfindən Mədinə şəhərinə yeni hakim tə`yin edilib. Bu camaat“ da təzə gələn hakimi təbrik etmək üçün onun hüzuruna gedirlər”–deyə mən cavab .verdim

İmam Baqir (ə) buyurdu: “Camaatın təbrik demək üçün zalım hakimin hüzuruna (getməsi, düzəx (cəhənnəm) qapılarının birindən içəri girmək misalındadır.”(٢)

İmam Baqirdən (ə) Abbasi sarayına getmək və orada xidmət etmək barədə :soruşanda, belə cavab verdi

(Heç vaxt, hətta bir xətt çəkmək miqdarında belə onlara kömək etmək lazım deyil.”(٣“

səh:٧۴

---

.Həmin, səh. ٨۵-٨٧ [٣٢] -١

.Vəsailüş-şiə, c. ١٢, səh. ١٣۵ [٣٣] -٢

.Dastanhai sahibdilan”, c. ٢, səh. ۵۶ -٣

Səid ibn Səhl Bəsəri belə nəql edir: “Bizim dövrdəki xəlifənin uşaqlarından birinin şərəfinə böyük qonaqlıq təşkil olunmuşdu. Bu məclisə çoxlu qonaq, o cümlədən İmam Hadi (ə) də də`vət olunmuşdu. İmam Hadi (ə) bu məclisdə iştirak etməyə məcbur idi.

İmam (ə) məclisə daxil olanda qonaqlar hörmət əlaməti olaraq sükut etdilər. Amma qonaqlar arasında cavan bir oğlan İmam Hadiyə (ə) məhəl qoymadan boşboğazlıq edir, ucadan gülürdü.

İmam Hadi (ə) üzünü həmin cavana tutub dedi: “Bu nə gülüşdür ki, sənin bütün vücudunu bürüyüb və Allahı tamamilə yaddan çıxarmısan. Halbuki üç gün sonra qəbir əhli ilə birgə olacaqsan.”

Cavan oğlan İmamın (ə) bu sözlərinə lap mat qalmışdı. O, artıq dinib danışmırdı. İmam Hadinin (ə) dediyi kimi, üç gün sonra həmin cavan oğlan öldü.”(١)



---

١- [٣٥] “Mənaqib ibn Şəhraşub”, c. ٤, səh. ٤١٤.

Hişam ibn Əbdülməlik (onuncu Əməvi xəlifəsi) çox zalım və xudpəsəndin birisi idi. O, bütün müsəlmanların haqqı olan Beytül-malı özü üçün və lazımsız yerlərə xərcləyərdi. .İmam Hadini (ə) onun əmrilə Mədinə şəhərində zəhərləyərək şəhid etdilər

Bir sözlə Hişam ibn Əbdülməlik Əhli-beytin (ə) qatı düşmənlərindən idi. O, Həzrət Əli (ə) .və sair İmamlar haqqında çəkinmədən nalayiq sözlər deyərdi

Zeyd ibn Əlinin başçılıq etdiyi qiyam zamanı minlərlə adamı onun əmrilə qətlə yetirdilər. O, Zeydin başını bədənindən ayırmağı, sonra isə başsız bədəni çılpaq vəziyyətdə dar ağacından asmağı əmr etmişdi. Sonra aylarla dar ağacından asılı qalan Zeydin qurumuş bədənini Hişam ibn Əbdülməlikin əmrilə yandıraraq külünü göyə .sovurdular

Hişam ibn Əbdülməlikin törətdiyi cinayətlər saysız hesabsızdır. Amma burada qeyd olunması zəruri olan məsələ budur ki, onun ölümündən sonra Vəlid ibn Yəzid hakimiyyətə gəlir. Qohum olmaqlarına baxmayaraq, Vəlid öz doğma əmisi olan Hişam .ibn Əbdülməlikə hədsiz nifrət edirdi

O, Hişam ibn Əbdülməlikin cəsədini qüsülsüz və kəfənsiz o qədər saxladı ki, meyyit artıq iylənməyə başladı. Axırda onun iylənmiş cəsədini ölü it kimi bir çalaya atıb üstünü .torpaqla basdırdılar

səh:۷۶

Bu əhvalat Nadir şah hakimiyyətə gəlməzdən öncə baş vermişdir. Nadir şah bir dəfə buğda almaq üçün Xorasan rayonunun kəndlərindən birinə yollanır. O, qala anbardarından bir miqdar buğda alır. Aldığı buğdanı çuvala doldurub getmək istəyəndə, buğda sahibi–Hacı Abbasqulu gəlib çıxır. O, Nadirin əlindəki çuvalı alıb buğdanı yerə boşaldır. Nadirin–“mən burada qonağam, bir neçə gün yubanmışam və buğdanı hansı qiymətə desəniz alıram”–deməsinə baxmayaraq, Hacı Abbasqulu ona buğda satmır. Çuvaldakı buğdaların hamısını boşaldandan sonra onu zorla anbardan .bayıra çıxarır

Nadir buğda sahibinə deyir: “Əgər dövlət adamı olsaydım, səninlə necə rəftar ”.edəcəyimi görərdin

Nə vaxt dövlət adamı olsan, deyərsən gözlərimi çıxartsınlar”– deyə Hacı Abbasqulu .onu ələ salır

O, çox mə`yus halda Hacı Abbasqulunun anbarını tərk edir. Hacı Abbasqulunun Nadirə dediklərini eşidən Hacı Əşrəfin ona ürəyi yanır. O, Nadiri evinə aparıb, ona xüsusi qulluq edir, sonra Hacı Əşrəf oğluna deyir ki, Nadirlə birlikdə anbara get və nə qədər .buğda istəyirsə ona ver. Buğdanın qiymətini də insafla hesabla

.Hacı Əşrəfin oğlu atasının dediyi kimi də edir. Hətta Nadir üçün yol azuqəsi də qoyur

Bir neçə il sonra Nadir qoşun başçısı (əmir) tə`yin edilir. O, bir gün Məşhədə gələndə .Hacı Abbasqulu ilə Hacı Əşrəfi çağırtdırır

Nadir əvvəlcə üzünü Hacı Abbasquluya tutub deyir: “Mənə nə dediyini xatırlayırsanmı? ”.İndi isə sənin istəyini yerinə yetirməyi əmr edəcəyəm

Nadirin əmrilə Hacı Abbasqulunun hər iki gözünü də kor etdilər. Sonra isə Hacı Əşrəfə dedi: Sənin anbarında buğda yığdığım zaman çarıqlarım yaddan çıxıb orada qalmışdı.” “Çarıqlarını harada qoymusansa elə orada da qalıb”–deyə Hacı Əşrəf cavab verir. O, çarıqları gətirmək üçün bir nəfəri Hacı Əşrəfin anbarına göndərir. Doğrudan da .çarıqlar öz yerində qalmışdı

Nadir Hacı Əşrəfin gözəl rəftarına, qonaqpərvərliyinə və əmanətdarlığına əhsən dedi. (O, bu gözəl xüsusiyyətlərinə görə Hacı Əşrəfi vergi ödəməkdən həmişəlik azad etdi.(١

### HƏKİM OLMAĞIMIN ƏSAS SƏBƏBİ

Öz dövrünün məşhur təbiblərindən olan rəhmətlik Mirzə Xəlil Tehrani buyurur: “Mənim tibb sahəsində heç bir səriştəm yox idi. Çünki bu elmə daha dəqiq yiyələnmək üçün nə müəllim yanına getmiş və nə də dərs oxumamışdım. Hal-hazırda tibb elmində əldə etdiyim bütün fəaliyyətlərə məsihi qadına verdiyim bir tikə çörəyin əvəzində nail :olmuşam.” O, başına gələnləri belə nəql edir



---

.Nadir şahın keşməkeşli həyatı, səh. ٢٥٢ [٣۶] -١

Macəra belə baş vermişdi: Bir dəfə Tehrandan Quma səfərə getmişdim. O vaxtlar çox “ cavan idim. Həmin il camaat bahaçılıq və qıtlıqdan əziyyət çəkirdi. Hətta bir tikə çörək tapmaq da mümkün deyildi. Qumda olduğum vaxt xəstəxana otaqlarından birində qalırdım. Bu hadisə İranla Rusiya arasında baş verən müharibə zamanına təsadüf .edirdi. Müharibədə əsir düşmüş rusları müxtəlif şəhərlərə göndərirdilər

Bir gün çörək almaq üçün bazara yollandım. Çox çətinliklə bir çörək alıb otağıma qayıdırdım ki, yolda qucağında körpə uşağı və acından rəngi qaçmış əsir rus qadınına :rast gəldim. Qadın məni görüb dedi

Siz müsəlmanlarda heç rəhm yoxdur. Çünki Allah bəndələrini əsir tutub, beləcə ac“ ”.saxlayırsınız

Qadına yazığım gəldi. Aldığım çörəyi ona verib, otağıma qayıtdım. Həmin gün yeməyə başqa bir şey tapmadığımdan ac qalmalı oldum. Birdən bir kişi həyəcanla qaldığım hücrəyə girib dedi: “Ay ağa, arvadım ağrıdan həlak olur. Əgər tanıdığın bir həkim ”.varsa, xahiş edirəm ünvanını mənə ver arvadımı onun yanına aparım

Elə bu vaxt ixtiyarsız olaraq dilimə bir dərman adı gəldi. Həmin şəxsə dedim: “Əgər ”.filan dərmanı xəstəyə versəniz, sağalar

Həmin adam mənim həkim olduğumu güman edib, dediyim dərmanı xəstə arvadına içirtmiş və dərman da qısa bir zamanda xəstəni sağaltmışdı. Xəstə qadın tam sağalandan sonra necə və kimin vasitəsilə müalicə

olduğu barədə öz tanış-bilişinə danışır. Bu əhvalatı eşidən xəstələr mənim ünvanımı soraqlaşıb tapırlar. Yanıma gələn xəstələr üçün ixtiyarsız olaraq dilimə gələn dərmanları yazırdım. Halbuki, mən bu dərmanların tərkibi haqqında heç nə bilmirdim. Yazdığım dərmanları qəbul edən xəstələr çox tez bir zamanda sağalmağa .başlayırdılar

Artıq bu sahədəki şöhrətim çox yerə yayılmışdı. Müxtəlif xəstəlikləri olan adamlar mənə müraciət edir və yazdığım dərmanlar nəticəsində çox qısa bir zamanda sağalırdılar. Bu müddət ərzində etdiyim təbabətin mənə çox böyük xeyri oldu. Həkim .Mö`minin "Töhfə" adlı kitabını aldım ki, heç olmasa dərmanların adını bilim

Bir müddət Qum şəhərində qaldıqdan sonra Tehrana qayıtdım. Çox tez bir zamanda məşhurlaşdım. Adım böyük tibb alimləri sırasında qeyd olundu. Bütün bunlara, məsihi (qadına verdiyim çörəyin əvəzində nail olmuşdum.(١

### SEYYİDLƏRƏ HÖRMƏTSİZLİYİN ACI SONLUĞU

Bu əhvalat ١٨٠۶-cı ilə təsadüf edir. Dövlət vergi mə`muru yoxsul bir seyyiddən vergi haqqını ödəməsini tələb edir. Maddi durumunun çox pis olduğunu və vergi ödəyə bilməyəcəyini deyən seyyidin sözləri qəddar



---

.Kəlmeyi-Təyyibə, Müntəxəbüt-təvarix", səh. ٨١٩" [٣٧] -١

mə`mura tə`sir etmir. Əksinə o, zavallı seyyidə daha da ağır işgəncə verməyə .başlayır

Yalvarışlarının heç bir faydası olmadığını görən seyyid, zalım mə`murdan bir həftə möhlət istəyib deyir: "İnşəallah Allah-təala bir çıxış yolu açar. Heç olmasa cəddim ".peyğəmbərdən həya et

Vergi mə`muru deyir: "Əgər sənin cəddin iş bacarandırsa, ya səni mənim şərimdən qurtarsın, ya da istəyini yerinə yetirsin." Sonra seyyiddən bir günlük zəmanət alıb deyir: "Əgər sabah səhər tezdən vergi haqqını ödəyə bilməsən, sənin boğazına ".nəcasət tökəcəyəm. Cəddinə də de ki, nə bacarırsa onu da etsin

Həmin mə`mur axşam evə qayıdanda evin damında yatır. Gecənin bir yarısı ayaqyoluna getmək üçün yuxudan ayılır. Qaranlıq olduğundan ayağını nərdivanın pilləsinə qoyanda nərdivanla birlikdə yerə yıxılır. Təsadüfdən həmin yerdə ayaqyolu üçün qazılmış quyu vardı və yıxılanda üzü üstə həmin nəcasət quyusuna düşür. Xoşbəxtlikdən həmin axşam heç kimin bu hadisədən xəbəri olmur. Sübhə qədər nəcasətin içində qalır. Səhər onu nəcasət quyusunun içində başı üstə göbəyinə qədər murdarçılığa batmış halda tapırlar. Mə`murun qarnına o qədər nəcasət dolmuşdu ki, (elə oradaca ölmüşdü.(١



---

.Pəndhayi-tarix", c. ١, səh. ۶۴" [٣٨] -١

Vəsailüş-şiə" kitabının müəllifi Şeyx Hürr Amili "İsbatül-huda" adlı digər bir kitabında" belə nəql etmişdir: "Məşhur məsihi təbibi Yuhənna deyirdi: Musa ibn İsanın sarayında olduğumuz vaxt müsəlman sərkərdələrdən biri Kərbəla türbəti ilə sağalan xəstələrdən :söz açdı. Bəni-Haşim qəbiləsindən olan bir nəfər onun sözünə əlavə edərək dedi

Biz əlacı olmayan xəstələrimizi onunla (Kərbəla türbəti) müalicə edirik. Musa ibn İsa" Əhli-beytin (ə) qatı düşmənlərindən biri idi. O, İmam Hüseyni (ə) və məclisdəkiləri ələ salmaq niyyəti ilə əyləşdiyi yerə bir az Kərbəla türbətindən tökməyi əmr etdi. Oturmağıyla "yandım, yandım"–qışqırığının ərşə qalxması bir olur. Bu vəziyyətdə məsihi təbiibn də əlindən bir iş gəlmir. Onun ciyərləri parça-parça olub ləyənə tökülür. Sonralar həmin təbib məsihi olmasına baxmayaraq Kərbəlaya, İmam Hüseynin (ə) .ziyarətinə gedir və müsəlman olur

Bir dəfə Şah Abbasın sarayında şahın xüsusi qonaqlarından olan bir məsihi alimi belə :deyirdi

İnsanların batinini görməyi bacarıram." Elə bu vaxt məclisdə oturan Şeyx Bəhai üzünü" ?həmin alimə tutub deyir: Mənim ovcumdakının nə olduğunu deyə bilərsənmi

Həmin alim bir az fikrə getdikdən sonra– "Nə olduğunu bilirəm. Amma sənin ovcuna nə cür

sığışdığından təəccüb edirəm. Çünki sənin ovcundakı Cənnətin bir hissəsidir”– deyə .cavab verir

(Şeyx Bəhai deyir: “Bəli, mənim ovcumdakı İmam Hüseynin (ə) türbətidir.”(۱

### (PEYĞƏMBƏRƏ HÖRMƏTSİZLİYİN AQİBƏTİ (۱

Peyğəmbərlə (s) get-gəl etməsinə baxmayaraq, Əqəbə ibn Əbi Muit hələ də müsəlmanlığı qəbul etməmişdi. Günlərin birində o, Peyğəmbəri (s) qonaq çağırır. Bunu eşidən Peyğəmbər (s) buyurur: “Qonaqlığa gələrəm, amma yeməyi bir şərtlə yeyərəm ki, sən müsəlmanlığı qəbul edəsən.” Əqəbə Peyğəmbərin (s) bu şərtilə razılaşır. Əqəbənin dostları bu işdən xəbər tutanda ona öz e`tirazlarını bildirirlər. O–“Məhəmməd (s) mənimlə yemək yesin deyə şəhadəteyni demişəm”– deyə onları razı salmağa çalışır. Dostları Əqəbəyə dedilər: “Əgər bizimlə dostluq etmək ”.istəyirsənsə, gərək ağzının suyunu Peyğəmbərin (s) üzünə atasan

O, öz nadan dostlarının bu axmaq fikrilə razılaşıb bu işi icra etmək istəyəndə, tüpürcək geri qayıdıb onun üzünə tökülür. Onun hər iki yanağını elə yandırır ki, ölənəcən izi (getmir.(۲



---

.İsbatül-hüda”, Şeyx Hürr Amuli“ [۳۹] -۱

.Tərcümei-əlğədir”, c. ۱۶, səh. ۶۶“ [۴۰] -۲

### (PEYĞƏMBƏRƏ HÖRMƏTSİZLİYİN AQİBƏTİ (۲

Ütbə Əbu Ləhəbin oğlu idi. O da atası kimi Peyğəmbərlə (s) düşmənçilik edərdi. “Nəcm” :surəsinin Peyğəmbərə (s) nazil olduğunu eşidən Ütbə dedi

Mən bu surəni qəbul etmir və ona inanmıram.” O, Peyğəmbərin (s) Me`racından bəhs“ edən bu surəni məsxərəyə qoyub inkar edərdi. Peyğəmbər (s) ürək ağrısı ilə ona belə ”.nifrin etdi: “Ey Allahım! Onu öz yırtıcı heyvanlarından birinə həvalə et

”?Biz ki, sənin yanındayıq. Bəs nədən qorxursan“

Məhəmməd (s) mənə nifrin etmişdir. And olsun Allaha, göylər Məhəmməddən (s)“ ”.doğru danışan başqa birinin üzərinə kölgə salmamışdır

Şir onu tapmasın deyə səfər yoldaşları öz yüklərini onun ətrafına toplayırlar. Buna baxmayaraq şir yüklərin üstünə çıxıb pəncəsiylə onları dağıtmağa başlayır. Amma şirin (əlinə keçmədən Ütbənin ürəyi partlayıb elə oradaca ölmüşdü.(۱



---

.Tərcümei şərhi-təcrid”, (Ağai Şüərani) səh. ۴۹۸“ [۴۱] -۱

## HƏZRƏT ƏLİNİN (Ə) VİLAYƏTİNİ İNKAR EDƏNLƏRİN AQİBƏTİ

:Cabir ibn Abdullah Ənsari belə nəql edir

Günlərin birində həzrət Əli (ə) camaat qarşısında moizə edirdi. Əvvəldə Allaha həmd-“ səna etdikdən sonra buyurdu: “Burada Məhəmmədin səhabələrindən dördü siz :camaatın qarşısındadır. Dediyim bu dörd nəfər bunlardır

.Ənəs ibn Malik .١

.Əş`əs ibn Qeys .٢

.Bəra ibn Azib Ənsari .٣

.Xalid ibn Yəzid Bəccəli .۴

Sonra bu dörd nəfərin hər birindən təkbətək bu sualı soruşdu. Əvvəlcə üzünü Ənəs ibn :Malikə tutub dedi

Ey Ənəs! Məgər sən Peyğəmbərin (s) mənim haqqımda dediyi bu sözləri eşitməmisən“ ”.ki,–“Hər kimin mövlası mənəm, Əli də onun mövlasıdır

Bunları eşitdiyin bir halda inkar etmiş olsan, Allah-təala səni bərəs (dəri xəstəliyi) xəstəliyinə düçar edəcək. Bu xəstəlikdən əmələ gələn ağ ləkələr başını və üzünü tamamilə bürüyəcək. Elə bir vəziyyətdə olacaqsan ki, əmmamə ilə də bu ağ ləkələri ”.gizlədə bilməyəcəksən

Sonra Əş`əs ibn Qeysə dedi: “Ey Əş`əs! Sən Peyğəmbərdən (s) mənim haqqımda eşitdiyinə şəhadət verməsən, ömrünün sonunda Allah-təala hər iki gözünü kor ”.edəcəkdir

səh:٨۵

Ey Xalid ibn Yəzid! Sən isə haqqı eşidib gizlətmiş olsan, Allah-təala səni cahillər kimi“ ”!öldürəcək

Sonda üzünü Bəra ibn Azibə tutub dedi: “Ey Bəra ibn Azib! Bunlar sənə də aiddir. Əgər sən də Peyğəmbərin (s) mənim haqqımda dediklərini dansan, Mədinəyə hicrət etdiyin ”.yerdə öləcəksən

Bu dörd nəfər Qədir-Xum günündə Peyğəmbərin (s) Əli (ə) haqqında dediklərini inkar .etdilər

:Cabir ibn Abdullah Ənsari deyir

Allaha and olsun, bir müddətdən sonra Ənəs ibn Malikin bərəs xətəliyinə“ tutulduğunun şahidi oldum. O, üz-gözündəki ağ ləkələri əmmaməsi ilə də gizlədə .bilmirdi

:Ənəs ibn Qeysin hər iki gözünün kor olduğunu gördüm. O, deyirdi

Allaha çox şükürlər olsun ki, Əlinin (ə) nifrini bu dünyada gözlərimin korluğu ilə sona“ yetdi. Nə yaxşı ki, O (Əli (ə)) məni əbədi əzabla nifrin etməyib. Yoxsa həmişəlik axirətdə .əzab içində olardım

Xalid ibn Yəzidin öz evində öldüyünü və ailəsinin onu evdə basdırmaq istədiklərini eşitdim. Amma “Kində” qəbiləsi bunu eşidib onun evinə hücum çəkir və cahiliyyət dövrünün adəti üzrə onu evinin qapısının kənarında basdırırlar. Beləliklə, də o, cahillər .kimi axirət evinə yollanır

Müaviyə, Bəra ibn Azibi Yəmənə hakim tə`yin etmişdi. O Yəməndə, yə`ni Mədinəyə hicrət etdiyi yerdə və zalım hakim olduğu bir halda dünyadan köçdü.(١)

İmam Hüseyndən (ə) belə rəvayət olunur: “Cö`də (Əş`əs ibn Qeysin qızı) atasının Əli (ə) ilə düşmənçilik etdiyini bilirdi. Ona görə də deyirdi ki: Əli (ə) onu alov boğazı adlandırmışdı. O bu adın səbəbini soruşanda, Həzrət buyurdu: “Əş`əsin ölüm vaxtı yetişəndə göydən boğaza oxşar alov şö`ləsi ona tərəf gələcək. Bu alov onu yandırıb qara kömürə döndərəcək.”

Belə də oldu. O, can verdiyi vaxt, və`d edilən həmin alovun onu yandırdığını gördülər. Əş`əs fəryad çəkib qışqırırdı: “Necə də pis imiş Əli (ə) ilə düşmənçiliyin nəticəsi.”(٢)

səh:٨٧

---

١- [٤٢] “Əlməvaizil-ədədiyyə”, səh, ١٢۶.

٢- [٤٣] “Əlməvaizil-ədədiyyə”, səh, ١٢۶.

Şeyx Müfid buyurur: "Bir gün Bağdadda Cə`fər adlı bir şəxs kitablarını hərraca qoyub satırdı. Yaxınlaşıb mən də bir neçə cild kitab aldım. Getmək istəyəndə Cə`fər mənə dedi: Otur. Şahidi olduğum bir mö`cüzəni sənə danışmaq istəyirəm. Bu sənə imanının daha da möhkəm olmasına kömək edər. Şeyx Müfid deyir ki, mən onun sözünü yerə salmayıb oturdum. Cə`fər dedi: Bir müddət dostumla birlikdə hədis və rəvayət elmlərini öyrənmək üçün Əbu Abdullah Mühəddis adlı bir şeyxdən dərs alırdıq. Sonralar onun həzrət Əli (ə) ilə qatı düşmən olduğu hamıya bəlli oldu. O, bə`zən Həzrətin şəxsiyyətinə təhqir edici sözləri deməkdən belə çəkinmirdi. Biz hər ikimiz ona nəsihət etməyə çalışırdıqsa da o, öz inadından dönməyib deyirdi: "Mən öz əqidəmdən heç vaxt dönmərəm."

Bir dəfə dərsdə o, həzrət Zəhraya (s) yaraşmayan söz deyəndə, artıq onun dərslərinə getməməyi qərara aldıq. "Bu cür şəxsdən dərs almağımızın faydası nədir?"– deyə düşündük.

Gecə yuxuda həzrət Əlinin (ə) Əbu Abdullah Mühəddisin evində oturduğunu gördüm. O Həzrət narazıçılıqla şeyxə dedi: "Axı sənə nə etmişəm ki, mənimlə düşmən olmusan? Məgər qorxmursanmı ki, Allah-təala səni kor edər?"

Bunu deyəndən sonra həzrət Əli (ə) şeyxin sağ gözünə işarə etdi. Yuxuda onun sağ .gözünün kor olduğunu gördüm. Elə bu vaxt yuxudan ayıldım

Səhər açılan kimi dostumla birgə Şeyxin evinə gedib onu bu məsələdən agah etmək qərarına gəldim. Elə bu fikirlə evdən çıxanda dostumun bizə tərəf gəldiyini görüb təəccüblə soruşdum: "Hara belə?" Dedi: "Dünən axşam bir yuxu görmüşəm, gəldim ki, onu sənə danışam." Yuxuda gördüyünü soruşanda mə`lum oldu ki, o da mən .gördüyüm yuxunu görmüşdür. Dostuma dedim: Elə mən də bu yuxunu görmüşəm

Birlikdə şeyxin mənzilinə yollandıq. Qapını döyəndə içəridən qadın səsi gəldi: Bu gün .dərs yoxdur

Biz–niyə bu gün dərs yoxdur?–deyə soruşduq. Qadın dedi: Şeyxin halı çox pisdir. Bu gün səhər açılandan əlini sağ gözünün üstünə qoyub qışqırır ki, Əli (ə) gözümü kor ".etdi

Elə biz də buna görə gəlmişik"– deyəndə qadın qapını açıb bizi içəriyə də`vət etdi." ".Şeyx bizi görüb dedi: "Axır ki, Əli (ə) məni kor etdi

Axşam yuxuda gördüklərimizi ona danışıb dedik ki, gəl bu inadından əl çək. Bəlkə ".Allah-təala sənə şəfa verə və Əlinin (ə) lütfü ilə də gözün sağala

Birdən qışqırıb dedi: "Əgər Əli (ə) o biri gözümü də kor etsə, yenə də mən öz "!düşmənçiliyimdən əl çəkməyəcəyəm

.Ayağa qalxıb onun mənzilini tərk etdik

səh:۸۹

Axşam yuxuda yenə həmin əhvalatı gördüm. Amma bu dəfə həzrət Əli (ə) şeyxin sol gözünə işarə edəndə, onun bu gözünün də kor olduğunun şahidi oldum. Bir müddətdən sonra onun mənzilinə gedəndə sol gözünün də kor olduğunu gördüm. Buna baxmayaraq onun həzrət Əliyə (ə) qarşı olan düşmənçiliyi daha da artmışdı. Axır (ki, bu şeyx küfr ilə dünyadan getdi və cəhənnəmə vasil oldu.(١

## HÖRMƏTSİZLİYİN AQİBƏTİ

Pərvazi-ruh" kitabının müəllifi belə nəql edir: Bir neçə il bundan əvvəl Kərbəlaya" ziyarətə getmişdim. Kərbəlada olduğum vaxt bir axşam yenə Həzrət Əbülfəzlin hərəmində ziyarət etməyə məşğul idim. Zərihin önündə iki cavanın mübahisə etdiyini gördüm. Onlardan biri nəsə demək istəyirdi ki, huşunu itirib yerə yıxıldı. Ziyarətə gələnlər yerə yıxılan cavan oğlanın başına toplaşdılar. Onun kimlərdən olduğunu .biləndən sonra tayfa başçısına xəbər verdilər

Tayfa başçısı dünyagörmüş ağsaqqal bir kişi idi. O cavan oğlanın huşunu itirməzdən əvvəl nə etdiyini soruşdu. Baş verənləri yaxından müşahidə etdiyim üçün dedim: "Nə ".isə (Həzrət Əbülfəzlə) demək istəyirdi ki, yerə yıxıldı



---

.Adabi əz Qur`an", səh, ٢۴۵" [۴۴] -١

Tayfa başçısı dedi: “Bu cavan oğlan Həzrət Əbülfəzlin qəzəibnə düçar olub. Çünki onun .bədəni göyərmiş və sümükləri sınmışdır

Həmin cavan oğlanı İmam Hüseynin (ə) hərəminə apardıq ki, bəlkə Allahın lütfü ilə şəfa tapa. O, iki gecə huşsuz halda İmam Hüseynin (ə) hərəmində qaldı. Əgər üçüncü gecəni də bu vəziyyətdə qalsaydı yəqin ki, ölümü qəti olacaqdır. Amma Allah-təalanın :lütfü ilə birdən hərəkətə gəldi və uzandığı yerdən qalxıb oturdu. O yanındakılara dedi

Mənim ayaqlarımı kəndirlə bağlayın və Həzrət Əbülfəzlin hərəminə tərəf çəkib“ aparın.” Onlar oğlanın dediyi kimi də etdilər. Həzrət Əbülfəzlin hərəminə yaxınlaşanda ”.dedi: “Filan məbləği dostuma və həmin miqdarda da kasıblara sədəqə verin

Dostları onun bu xahişinə əməl edəcəklərinə söz verdilər. Sonra o çox üzgün və qəlbi sınmış halda Həzrət Əbülfəzlin hərəminə daxil olub ərəb dilində o həzrətə belə xitab ”.etdi: “Camaat içində bu cür abrımı aparacağını heç gözləməzdim

.Elə bu vaxt tayfa başçısı şəfa tapmış bu cavanı qucaqlayıb öpdü

Ara sakitləşəndən sonra həmin oğlanın yanına gedib soruşdum: Əvvəldən bu vaxta qədər baş verənlərin yaxından şahidi oldum. Amma bütün bunların nəyə görə baş .verdiyinin səbəbini bilmək istərdim

Cavan oğlan dedi: “Mənimlə birlikdə hərəmə daxil olan oğlana bir qədər borcum var idi. O həmin gün

borcumu qaytarmağımı istəyirdi. Onun sözləri mənim xətrimə dəydi. Buna görə də dedim: “İndi ki belədir, mənim sənə heç bir qəpik də borcum yoxdur.” Dostum əsəbiləşib dedi: “Əgər düz deyirsənsə Həzrət Əbülfəzlə and iç.” Mən də utanmadan and içmək istəyirdim ki, nə baş verdiyini bilmədim. Bu axşama qədər bütün bədənim çox pis ağrıyırdı. Huşsuz halda olduğum vaxt İmam Hüseynin (ə) gəlişi üçün xüsusi .mərasimə hazırlıq aparıldığını gördüm

Nə baş verdiyini soruşanda, kimsə dedi: “Həzrət Əbülfəzl qardaşının görüşünə gəlir. Mən üzr istəmək üçün sürünə-sürünə oraya yaxınlaşanda Həzrət Əbülfəzlin başım üstə durduğunu gördüm. O həzrət ayağının ucu ilə mənə vurub dedi: “Qalx ayağa. Elə bir evə gəlmisən ki, ona təvəssül edən şəxs naümid qayıtmaz. Həmin vaxt artıq ”.bədənimdə heç bir ağrının olmadığını hiss etdim

**(TAMAHKAR TACİR (۱**

Əvvəllər telefon və digər texniki vasitələr olmadığından camaat başqa ölkə və şəhərlərdən çox gec-gec xəbər tutardılar. Adətən tacirlər özləri ticarət məqsədilə bir şəhərdən digər şəhərə səfər edərdilər. Bə`zən ticarət malları gecikir və yaxud birdən-birə eyni maldan çoxlu miqdarda bazara gəlirdi ki, bu da qiymətlərin tez bir zamanda .artıb-azalmasına səbəb olurdu

Günlərin birində bir şəhərdə yaşayan iki tacir gəmi ilə ticarətə gedirlər. Alış-veriş edəndən sonra aldıqları malları gəmilərə yükləyib vətənə qayıdırlar. Söhbət əsnasında mə`lum olur ki, tacirlərdən biri yağ, digəri isə mis qablar almışdır. Hər iki tacir Allaha .təvəkkül edərək aldıqları malları yaxşı qiymətə satmaq haqqında düşünürdülər

Gəmiçilər arasında belə bir adət var idi ki, iki gəmi dənizdə bir-birilə rastlaşanda lövbər .salıb gəlib-getdikləri yerlərdən hal-əhval tutardılar

Bir neçə həftə yol gəldikdən sonra tacirlərin olduğu gəmi başqa bir gəmi ilə rastlaşır. Hər iki gəmi lövbər salıb dayanır. Yükü ancaq yağ olan tacir kapitanların söhbət etdiyini görüb qonşu gəmiyə keçmək üçün icazə alır. Bu tacir çox zirək adam idi. Hər bir fürsətdən istifadə etməyi gözəl bacarırdı. Amma mis qablar almış tacir bütün bunlara məhəl qoymazdı. O, həmişə deyərdi: Bizim vəzifəmiz ticarət etmək, qismət isə .Allahdandır. Səndən hərəkət, Allahdan bərəkət

Çoxbilmiş tacir öz səfər yoldaşının yatdığını görüb qonşu gəmiyə keçir. Apardığı sorğu-sual nəticəsində mə`lum olur ki, yağ bazarı çox kasaddır. Əksinə, misin qiyməti isə birdən-birə qalxmışdır. Bunu eşidəndə səfər yoldaşı üçün plan çəkməyə başlayır. O, .aldıqları malları bir-biri ilə dəyişməyi tacir yoldaşına təklif edir

Mis qablar almış tacir deyir: Əgər sən razısansa mənim də heç bir sözüm yoxdur. .Nədənsə ürəyimə gəldi ki, sənin bu təklifini qəbul edəm

Xülasə, oturub mübadiləni birlikdə başa vurdular. Mis taciri bu işin əsil səbəbini bilmirdi. Əksinə yağ taciri misi satmaqla çoxlu mənfəət əldə edəcəyinə əmin idi. Amma adi bir hadisə hiyləgər tacirin bütün hesab-kitabını dəyişdi. Sahilə bir neçə fərsəx qalırdı. Zülmət bir gecədə güclü tufan başladı. Hündür dalğalar gəminin bir tərəfini söküb apardı. Artıq su gəmiyə dolurdu. Vəziyyəti belə görən kapitan nigaran halda sərnişinlərə dedi: Dostlar, hamımızın canı təhlükə qarşısındadır. Əgər gəminin yükünü boşaltmasaq gəmi batacaq. Gəmidəki bütün yükləri dənizə boşaltmaqdan başqa çıxış .yolumuz yoxdur

Tacirlər kapitana öz e`tirazlarını bildirdilər: Əgər biz bütün sərmayəmizi dənizə töksək .müflis olacağıq

Mən sizi başa düşürəm. Amma indi hər şeydən mühüm insanları xilas etməkdir. Əgər“ tez bir zamanda gəminin yükü boşalmazsa, hamılıqla dənizdə batacağıq. Gəminin kapitanı mənəm və burada olan insanların məs`uliyyəti mənim üzərimdədir. Dediklərimə əməl etməyən şəxsin özünü də dənizə atacağıq– deyə kapitan cavab .verdi

Gəmi artıq sahilə çatırdı. Hər iki tacir çox narahat halda gəmini tərk etdilər. Amma onların ticarətlərinin nəticəsi tam əksinə olmuşdu. Yağ alveri edən tacirin səfər yoldaşından aldığı mis qablar dənizin dibinə batmış, mis alveri edən tacirin aldığı yağ qabları suyun üzündə qalmışdı. Dalğalar yağ çəlləklərini sahilə tərəf itələyirdilər. Tufan sakitləşəndən sonra qayıqların

.köməyilə yağ çəlləklərini suyun üzündən çəkib qayıqlara yığdılar

Çox zirək və hiyləgər olmasına baxmayaraq yağ alveri edən tacirin hiylə ilə aldığı mis qablar əlindən çıxdı. Amma sadə və sədaqətli mis tacirinin mis qablarla dəyişdirdiyi .bütün yağ qabları heç bir zərər toxunmadan sahilə gətirildi

(Bəli, hiyləgərliyin sonu yoxdur.(١

### (TAMAHKAR TACİR (٢

Mahmud Əfqan İsfəhan şəhərini işğal edəndən sonra Şirazı da ələ keçirmək istəyir. Buna görə də Zibərdəstxanın rəhbərlik etdiyi böyük bir qoşunu Şiraz şəhərinə göndərir. Qoşun şəhərə çatanda qala divarlarının basılmaz olduğuna əmin olur. Buna .baxmayaraq bir-neçə dəfə şəhərə hücum edən əfqan qoşunu məğlubiyyətə uğrayır

Nəticədə çarəsiz qalıb həmişəki döyüş metodlarından istifadə etməli olurlar. Əfqan qoşunu şəhəri bütünlüklə mühasirəyə alır. Zibərdəstxanın fikrincə bu mühasirə çox uzun çəkməyəcəkdi. Şəhər əhalisinin azuqəsi bitəndən sonra aclığa dözməyəcək və məcburiyyətdən təslim olacaqdır. Amma şəhərin mühasirəsi səkkiz ay çəkdi. Uzun müddət mühasirədə qalmış şəhər əhalisi artıq qıtlıqdan əziyyət çəkirdilər. Hətta onlarla adam acından



---

.Qessehayi-xub”, c. ۶, səh. ۵۷“ [۴۵] -١

ölmüşdü. Mühasirədə qalmaqdan cana yığılmış camaat əfqan qoşununu birdəfəlik məğlub etmək istəyirdilər. Bunun üçün də səngərləri buraxıb şəhərdən kənara çıxırlar. Amma aclıqdan zəifləmiş Şiraz əsgərləri qızğın döyüşdə məğlub oldular. Beləliklə, ۱۱۳۷-ci ildə (h.) Şiraz şəhəri əfqanlıların işğalı altına keçir. Döyüşdə qələbə çalmış əfqan əsgərləri şəhəri təftiş edərkən küçələrdə və evlərdə aclıqdan ölmüş cəsədlərə rast .gəlirdilər

Əfqanlılar şəhərin başqa bir tərəfində buğda ilə dolu anbar kəşf etdilər. Bu tamahkar bir tacirin anbarı idi. Anbarda bütün Şiraz əhalisinə yetəcək üç aylıq azuqə toplanmışdı. Öz həmvətənləri aclıqdan əziyyət çəkdiyi bir halda bu tamahkar tacir, buğdaları münasib vaxtında daha baha qiymətə satmaq məqsədilə anbarda yığıb saxlamışdı. Əfqanlı əsgərlər acgöz taciri tutub zindana apardılar. Bir tərəfdən həris tacirin bu əməlinə sevinən Zibərdəstxan digər tərəfdən də çox narahat olurdu. Sevinirdi ona görə ki, buğdanı anbarda yığıb saxlaması şirazlıların üç ay daha tez məğlub olmasına səbəb olmuşdu. Onu narahat edən məsələ isə bu tacirin dünya malına olan hədsiz hərisliyi idi. Çünki bu hərislik təkcə Şiraz camaatının deyil, onun özünün də ölümünə .səbəb olmuşdur

Beləliklə, dünya malına olan tamah tacirə canı bahasına başa gəldi. Onun yığıb .saxladığı buğda Zibərdəstxanın qan içən qoşununa nəsib oldu

səh:۹۶

(Zibərdəstxanın əmrilə tamahkar taciri dar ağacından asdılar.(١)

## ƏMƏLLƏRİN CƏZASI

Nasirəddin şahın belə bir adəti vardı ki, qabaqcadan tə`yin olunmuş bir gündə zindanlara baş çəkərdi. O, məhbuslardan hansına işarə etsəydi bu həmin adamın e`dam olunması demək idi.

Zindandakılar arasında bir nəfər adam öldürdüyünə görə həbs edilmişdi. Həmin adam zindan rəisinin yaxın qohumu idi. Buna görə də bə`zən ailəsini görmək üçün ona evə getməyə icazə verilərdi. Zindanban bir axşam yenə həmin məhbusu evə buraxmışdı. Məhbus evinə gedəndən sonra zindanbanın yadına düşür ki, şah sabah zindana gələcək. Zindanban nə edəcəyini bilməyib lap çaş-baş qalmışdı. Çünki, şah və onun yanındakılar zindandakı məhbusların nömrələrini bilirdilər. Bir nəfərin əskik olduğunu bilsəydilər, zindanbanın özünü e`dam edəcəkdilər. Qorxu onu bu çıxılmaz vəziyyətdən qurtarmaq üçün çarə düşünməyə vadar etdi. Belə qərara gəldi ki, evə gedən məhbusun yerinə bir nəfəri tapıb qoysun.



---

١- [۴۶] “Nadir şahın həyatı”, səh. ٨٩.

Zindan rəisinin çox səmimi dostu olan qəssab bir qonşusu var idi. Fürsəti əldən vermədən qəssab qonşusunun yanına gedib əhvalatı ona danışdı. “Əziz dostum, gəl mənə bu çıxılmaz vəziyyətdən qurtarmağa kömək et. Bir neçə dəqiqəliyə məhbus paltarı geyinib zindanda otur. Şah zindana gəlib-gedəndən sonra sən də öz işinin dalınca gedərsən”– deyə zindanban ondan xahiş etdi. Qəssab dostunun xahişini qəbul edib zindana getdi. Səhər açılanda şahın gəlişi üçün məhbusları cərgəyə düzdülər. Məhbusların nömrələri bir-bir oxunandan sonra, birdən şahın gözü qəssaba sataşdı. Onun firavan həyat keçirməsi piy bağlamış bədənindən mə`lum idi. Nasirəddin şah .qəssaba işarə edib oradan keçdi

Cəllad qəssabın yoğun boğazından tutub e`dam ediləcək yerə gətirdi. Əvvəlcə bütün baş verənləri zarafat kimi qəbul edən qəssab birdən məsələnin ciddi olduğunu anladı. Bir anlıq ölüm mələyi gözləri önündə canlandı. Yalvar-yaxar edib özünü cəlladın ayaqları altına atdı. Məsələnin nə yerdə olduğunu ona danışdı. Amma çox yazıq ki, .bunların heç bir faydası yox idi. Çünki, şahın fərmanı sorğu-sualsız icra olunmalı idi

:Cəllad üzünü qəssaba tutub dedi

Bəlkə nə vaxtsa bir cinayət etmisən ki, indi bu bəlaya düçar olmusan. Əgər doğrudan“ .da belə bir iş tutmusansa, danış. Ola bilsin səni işgəncə ilə deyil, daha rahat öldürüm

Qəssab çox fikirləşdi. Axı bu müsibət onun hansı günahının cəzası idi. Amma birdən neçə il bundan əvvəl

bir uşağın başına açdığı cinayəti xatırlayıb dedi: “Bir dəfə cavan vaxtlarımda öz həmyaşıdlarımla birlikdə üzməyə getmişdik. Dostlarım bir az üzəndən sonra sudan çıxıb getdilər. Mən isə hovuzun içində üzməyə məşğul idim. Elə bu vaxt hovuzda azyaşlı bir uşağın da üzdüyünü gördüm. Bir az sonra həmin uşaq çox yorğun halda özünü hovuzun kənarına çatdırıb sudan çıxmaq istədi. O, balaca əllərilə hovuzun divarlarından tutub sudan çıxmaq istəyirdi. Mən isə onu ayaqlarımla geri itələyib suya atırdım. Uşaq yalvarıb məndən kömək istəyirdi. Amma mən onun həyatla-ölüm arasında çarpışmasından ləzzət alırdım. Mənim inadım üzündən zavallı uşaq axır ki, suda boğuldu. Uşağın bədəninin suyun üzündə hərəkətsiz qaldığını görəndə qorxub .aradan çıxdım

Qəssabın danışdıqlarına diqqətlə qulaq asan cəlladın gözləri birdən qanla doldu. O :bağıraraq qəssaba dedi

Vay olsun sənə! O uşaq mənim kiçik qardaşım idi. Deməli uzun müddət axtardığım“ qatil sənmişsən. Mən bu təsadüfdən çox şadam. Çünki, qardaşımın qatilini bu gün öz ”.əllərimlə öldürəcəyəm

Bu hadisədən sonra uzun müddət zindandakı məhbuslar arasında günahların .cəzasından söz düşəndə həmin əhvalatı bir-biri üçün nəql edərdilər

səh:۹۹

İsa peyğəmbərin (ə) dini təbliğ etmək üsullarından biri də səyahətə çıxmaq idi. Günlərin birində peyğəmbərin yaxın dostu olan cırtdan adam da onunla səyahətə gedir. Bir müddət yol gedəndən sonra dəniz sahilinə yetişirlər. İsa (ə) tam yəqinliklə “Bismillah” deyib dənizin üzərində yeriməyə başlayır. Bunu görən cırtdan adam da sidq ürəkdən “Bismillah” deyib özünü İsaya (ə) çatdırır. Elə bu vaxt onun ürəyində təkəbbür və xudpəsəndlik hissi yaranır. Bir anlıq öz-özünə fikirləşir: “Ay Allah, suyun üzərində batmadan yeriyən şəxs sənin peyğəmbərin İsadır (ə). Adi bir insan olduğum halda ”?mən də bu işi bacarıram. Bəs elə isə peyğəmbərlə mənim aramda nə fərq var

Elə həmin an ayağının altı birdən boşalır və o suya batır. O, qışqırıb İsadan (ə) kömək istəyirdi: “Ey Ruhullah! Mənə yardım et.” İsa (ə) cırtdan adamın əlindən tutub sudan :çıxardı. Sonra ona dedi

”.Məgər sən nə dedin ki, suyun üzərində yeridiyin vaxt birdən-birə batdın“

Cırtdan adam dedi: “Öz-özümə dedim ki, həm Allahın peyğəmbəri və həm də mən suyun üzərində yeriyə bilirik. Belə bir halda peyğəmbərlə (ə) mənim aramda nə fərq oldu. Bir anlıq məndə xudibnlik hissi yarandı. Nəticədə mən öz əməlimin cəzasını ”.çəkdim

səh:١٠٠

İsa (ə) cırtdan adama dedi: “Özünü Allah-təalanın sənə məsləhət bilmədiyi məqama layiq gördün. Qəlbindəki xudibnliyə görə Allah-təalanın sənə qəzəbi tutmuşdur. İndi ”.isə dediklərindən tövbə et

Cırtdan adam öz əməlindən peşman olub tövbə edir. Beləliklə, Allah-təala onu əvvəlki .məqamına qaytarır

İmam Sadiq (ə) bu əhvalatı nəql edəndən sonra buyurdu: “Elə isə Allahdan qorxun və (pərhizkar olun. Bir-birinizə həsəd aparmayın.”(١

## KƏKLİKLƏRİN ŞƏHADƏTİ

Bir neçə quldur qərb rayonlarından birində yol kəsib, adam soymaqla məşğul idilər. Günlərin birində həmin quldurlar bir nəfərin yolunu kəsib bütün pul-parasını soyurlar. Sonra həmin adamı ağaca bağlayıb öldürmək istəyirlər. Zavallı adam quldurlara :yalvarıb deyir

Siz ki, mənim bütün olan-qalan pulumu soyub götürmüsünüz. Məni öldürməklə siz nə“ qazanacaqsınız? Mən gündəlik gəlirlə dolanan birisiyəm. Ona görə də körpə uşaqlarımın mənsiz dolanışığı çox çətin olar. And olsun Allaha, götürdüyünüz bütün ”.pul-paramı da sizə halal edirəm

:Quldurlar gülüb dedi



---

.Üsuli-kafi”, c. ٢, səh, ٣٠۶“ [۴٧] -١

Əgər biz halal ruzi qazanmaq istəsəydik, o zaman yol kəsib adam soymağı özümüz“ ”.üçün gəlir mənbəyi seçməzdik

.Bəs qiyamət günü Allah qarşısında nə cavab verəcəksiniz?–deyə yazıq kişi dilləndi

Quldurlar dedilər: “Bu vaxta qədər kim qiyamətdən xəbər gətirib? Çünki, qiyamət yoxdur.” Quldurlar onu öldürmək istəyəndə zavallı kişi üzünü daşın üstündə oturub :oxuyan iki kəkliyə tutub deyir

”.Ey quşlar, siz şahid olun ki, bu insafsızlar məni amansızcasına öldürdülər“

.Quldurlar kişinin bu sözlərinə gülə-gülə onun başını bədənindən ayırırlar

Artıq bu əhvalatdan bir-neçə il keçmişdi. Bir gün əmirlərdən biri öz qulluqçuları ilə həmin ərazidə ova çıxmışdı. Təsadüfən əmir burada həmin quldurlarla rastlaşır və onlardan ov haqqında soruşur. Quldurların kimliyindən xəbəri olmayan əmir onlara ”.deyir: “Əgər bizə bələdçilik etsəniz, sizə zəhmət haqqı verəcəyəm

Quldurlar axşam çağına qədər əmir və onu müşayiət edənlərə ov ovlamaqda yardımçı olurlar. Ovlardan kabab bişirib əmir üçün gözəl bir süfrə açırlar. Ovlanmış heyvanlar arasında bir-neçə kəkliyi də kabab edib süfrəyə gətirirlər. Kəklikləri quldurlar özləri ovlamışdılar. Əmir onlara öz ovladıqları kəkliklərdən yeməyi təklif etdi. Kabab olmuş kəklikləri görən quldurlar bir-birinə göz vurub güldülər. Onlar getdikcə daha ucadan gülməyə

.başladılar. Artıq onlar gülməkdən özlərini saxlaya bilmirdilər

Qudlurların ədəbsizliyini görən əmir bərk əsəbiləşdi. Onları ağaca bağlayıb çoxlu qamçı vurmağı və yersiz gülməklərinin səbəbini soruşmağı əmr etdi.

Quldurlar dedilər: "Ey əmir, bizim gülüşümüzün səbəbi sən deyilsən."

"Bəs niyə gülürsünüz?"–deyə əmir onlardan soruşdu.

Onlar bir neçə il bundan əvvəl yazıq kişinin başına açdıqları müsibəti əmir üçün nəql etdilər. Quldurlar bunu fəxrlə əmirə danışıb dedilər:

"Əmir sağ olsun! Bizim gülməyimizin səbəbi kabab olmuş kəkliklərin qiyamət günü necə şəhadət verəcəyi idi."

Əmir onlara dedi: "Kəkliklər sizin dilinizlə şəhadət verdilər. Bu gün isə sizin üçün qiyamət günüdür." Sonra quldurlara öldürdükləri zavallı kişidən oğurladıqları əşyaların yerini deməyənə qədər qamçı vurmağı əmr etdi.

Əmir quldurlar tərəfindən öldürülmüş kişinin uşaqlarını çağıtdırıb atalarının oğurlanmış əşyalarını və həmçinin quldurlardan aldığı qan bahasını onlara verdi. Sonra uşaqların gözü önündə quldurların başlarını bədənlərindən üzməyi əmr etdi.(١)

səh:١٠٣

---

١- [۴٨] "Xoşbəxtlik xəzinəsinin açarı", səh. ٩٠.

İbn Abbas deyir: “Mədinə şəhərində yaşayan bir kişinin həyətində xurma ağacı var idi ki, bu ağacın bir neçə budağı kasıb qonşusunun həyətinə sallanırdı. Xurma ağacının sahibi hər gün evinə gələndə ağacın başına çıxıb bir neçə salxım xurma dərərdi. Bə`zən qonşu uşaqları öz həyətlərinə tökülən xurmaları yerdən yığıb yeyərdilər. Ağac sahibi utanmadan xurmaları qonşu uşaqlarının əlindən alar, hətta çeynəmiş olsaydılar belə barmağını salıb ağızlarından çıxarardı. Bununla da öz nanəcibliyini onlara .göstərərdi

Kasıb qonşu Peyğəmbərin (s) yanına gedib nanəcib qonşusundan şikayətlənir. ”.Peyğəmbər (s) ona buyurur: “Sən get, mən özüm bir çıxış yolu fikirləşib taparam

Bir gün xurma ağacının sahibi ilə Peyğəmbər (s) görüşürlər. Peyğəmbər (s) ona buyurur: “Budaqları filan qonşunun həyətinə sallanan xurma ağacını cənnətdəki ”?xurma ağacıyla dəyişərsənmi

Mənim çoxlu xurma ağacım var. Amma onların içərisində ən yaxşı məhsul verən sizin“ .dediyiniz həmin ağacdır”– bunu deyib oradan uzaqlaşır

Əbu Dəhdah adlı çox nəcib bir şəxs Peyğəmbərin (s) o şəxslə danışdıqlarını eşidəndə o Həzrətin yanına gəlib deyir: “Əgər mən həmin xurma ağacını o şəxsdən alıb sizə “?bağışlasam, cənnət bağlarındakı xurma ağacından mənə də qismət olacaqmı

Əlbəttə"–deyə Peyğəmbər (s) cavab verdi. Əbu Dəhdah ağac sahibinin yanına gedib "?dedi: "Bu xurma ağacını mənə neçəyə satarsan

Peyğəmbər (s) bu ağacın əvəzində mənə cənnətdəki xurma ağacını vəd etdi. Amma" mən razılaşmadım. Çünki, bu ağacın xurması başqa ağacların meyvəsindən daha lətif və ləzizdir"–deyə ağac sahibi dilləndi. Əbu Dəhdah ondan soruşdu: "Düzünü de görüm, "?bu ağacı satmaq fikrin varmı

.Ağac sahibi dedi: Əgər onun əvəzində çoxlu mal verən olsa, sataram

.Nə qədər istəyirsən?–Deyə Əbu Dəhdah ondan soruşdu"

".Həmin şəxs dedi: "Bir xurma ağacının əvəzində ۴۰ xurma ağacı

Çox baha deyirsən"– deyə Əbu Dəhdah narazı halda cavab verdi. Amma sonra nə isə" .fikirləşib onun şərtilə razılaşdığını bildirdi

Ağac sahibi ona dedi: "Əgər dediklərin doğrudursa bir-neçə şahid gətir." Əbu Dəhdah onun dediyi kimi də etdi. Sonra Əbu Dəhdah Peyğəmbərin (s) hüzuruna gedib dedi: "İndi həmin xurma ağacı mənim ixtiyarımdadır. Mən onu sizə bağışlayıram." Peyğəmbər (s) bunu eşidəndə kasıb kişinin mənzilinə yollandı. "İndi bu xurma ağacı .sənə və ailə üzvlərinə məxsusdur"–deyə Peyğəmbər (s) ona müjdə verdi

Əbu Dəhdah, ağac sahibinin əksinə olaraq comərdlik edib, nəciblik göstərdiyinə görə :onun haqqında bu ayələr nazil oldu

Kim malını Allah yolunda versə, Allahdan qorxsa və ən gözəl sözü (La ilahə illəllah“ kəlməsini) təsdiq etsə, Biz ona ən asan olanı (Cənnəti) müyəssər edəcəyik. Amma kim (malını Allah yolunda xərcləməyə) xəsislik etsə, (mal-dövlətinə güvənib Allaha) möhtac olmadığını sansa və ən gözəl sözü (La ilahə illəllah kəlməsini) yalan saysa, Biz ona ən çətin olanı (Cəhənnəmi) müyəssər edəcəyik. (Onu Cəhənnəm üçün hazırlayacağıq). (O, (Cəhənnəmə) düşəcəyi zaman mal-dövləti ona heç bir fayda verməz.”(١)



---

.Dastanhaye sahibdelan”, c. ١, səh. ٢١٧“ [۴٩] -١

## ZİNAKARLAR HAQQINDA

Zina bəhsinə daxil olmazdan öncə mühüm bir nöqtəni xatırlatmaq yerinə düşərdi. Əgər tarixə nəzər salsaq, hər hansı bir millətin din, e`tiqad, şərafət və insanlıq baxımından süqut etməsinin səbəbini, həmin millətin daxilində yoluxucu xəstəlik kimi .yayılmış əxlaqsızlığın nəticəsi olduğunu görərik

Bir çox böyük şəxsiyyətlərin qamətini qıran və onları ən alçaq dərəcəyə çatdıran ahu :gözlü, şux qamətli qadınlar olmuşlar. Belə ki, Napaleon bu barədə deyir

Gözəl bir qadına olan cinsi meyldən başqa heç bir qüvvə məni tə`sir altına sala“ ”.bilməz

Hal-hazırda güclü dövlətlər öz rəqiblərini məğlub etmək və onların dövlət sirlərini öyrənmək üçün ən gözəl qadınlardan casus kimi istifadə edirlər. Bə`zən bir gecədə .alçaq dövlət adamları bütün ölkəni bir qadının aldadıcı gözəlliyinə qurban verirlər

:Şəhvət, həvəs, şorgözlük dalınca gedənlərin aqibəti çox pis olacaqdır. O cümlədən

;Günaha aludə olmaq-١

.Şəhvətdə ifrata varmaq insanı istər-istəməz şəxsiyyətsizliyə aparıb çıxarır

.Şəhvət insanın çirkinlikləri gözəl və gözəllikləri çirkin görməsinə səbəb olur

;Ağlın fəsadı-٢

Şəhvətpərəstlik qalın bir pərdə kimi insanın ağıl və düşüncəsinin üzərini örtür. Nəticədə şəhvətpərəst insan haqqı batil, batili isə haqq kimi görür. Əmirəlmö`minin Əli ".(ə) bu barədə buyurur: "Şəhvətpərəstlik ağlı fasid edir

;Ləkələnmək-٣

:Şəhvətpərəstlik insan heysiyyətini ləkələyir. Həzrət Əli (ə) buyurmuşdur

Şəhvətdə ifrata varmaq insan şəxsiyyətinin ləkələnməsinə və insanlığın, mürüvvətin" ".aradan getməsinə səbəb olur

.Rüsvayçılıq-۴

.Şəhvətpərəst insan gec-tez hamı yanında rüsvay olur və abır-həyası aradan gedir

Misir padşahının arvadı Züleyxanı buna misal göstərə bilərik. Züleyxa hədsiz şəhvət və Yusifə (ə) olan yersiz eşqi nəticəsində aləmdə rüsvay oldu. O, həm özünü və həm də .saray qadınlarını rüsvay etdi

səh:١٠٩

## QUR`AN AYƏLƏRİ

Allah-təala Qur`anda zinanın çirkin bir əməl olması və zinakarların cəzası haqqında :buyurmuşdur

(Heç vaxt zina etməyin. Çünki bu çox çirkin bir əməldir.”(١)“

:Başqa bir ayədə özlərini zinadan qoruyan kişilər barədə buyurur

Ya Rəsulum! Mö`min kişilərə de ki, gözlərini haram edilmiş şeylərdən çevirsinlər.“ (naməhrəmə baxmasınlar), ayıb yerlərini zinadan qorusunlar (və ya örtülü saxlasınlar.) (Bu onlar üçün (ədəb-ərkan, təmizlik baxımından), daha yaxşıdır.”(٢

:Bu ayənin ardınca mö`min qadınlara da özlərini zinadan qorumaq haqqında buyurur

Mö`min qadınlara de ki, gözlərini haram buyurulmuş şeylərdən çevirsinlər,“ (naməhrəmə baxmasınlar), ayıb yerlərini (zinadan) qorusunlar (və ya örtülü) (saxlasınlar.(٣

## HƏDİSLƏR

Me`rac xəbərlərində qeyd olunan hədislərdən birində yazılmışdır ki, Peyğəmbər (s) :buyurur

Me`raca getdiyim gecə bir dəstə adamların bədənlərinin alovlu daraqlarla“ darandığını müşahidə



---

.Bəni-İsrail”, ayə, ٣١“ [٥٠] -١

.Nuh”, ayə ٣٠“ [٥١] -٢

.Nuh”, ayə ٣١“ [٥٢] -٣

edəndə Cəbrayıldan (ə) soruşdum: “Bunlar kimlərdir və hansı günaha mürtəkib ”?olmuşlar

Cəbrayıl (ə) dedi: “Bunlar haram yolla gedənlər– naməhrəm qadınlarla zina (edənlərdir.”(١

Başqa bir hədisdə Peyğəmbərin (s) vəfatından öncə söylədiyi xütbəsi qeyd :olunmuşdur

Allah-təala yəhudi, məsihi və ya müsəlman qadınla zina edən şəxs üçün cəhənnəm“ qapılarından üç yüz altmışını açar. Bu qapıların hər birindən çıxan ilanlar, əqrəblər və alov şö`ləlləri zinakar şəxsi qiyamət gününə qədər yandırıb yaxar. Qiyamət günündə camaat onun övrətinin kəskin iyindən əzab çəkərlər. Bələliklə də onlar hamının (yanında rüsvay olarlar.(٢

:Həzrət Əli (ə) buyurmuşdur

Qimayət qopan zaman Allah-təalanın əmrilə külək əsməyə başlayacaq. Camaat“ küləyin gətirdiyi çox pis iyi hiss edəcəklər. Məhşər ayağına yığılanlar həmin üfunət .iyindən əziyyət çəkəcəklər

Həmin vaxt Allah carçısı fəryad çəkib soruşacaq: “Ay camaat! Sizi narahat edən bu ?üfunət iyinin haradan gəldiyini bilən varmı

.Camaat deyəcək: “Bu tövbəsiz dünyadan gedən zinakarların övrətlərinin iyidir

:Sonra camaata deyəcəklər

Ey qiyamət əhli! Allah-təala onları (zinakarları) lə`nətlədiyi kimi, siz də onları“ .lə`nətləyin



---

.”Ləalil-əxbar“ [٥٣]-١

.Həmin mənbə, səh. ١٩٣ [٥٤]-٢

.Qiyamət əhli deyəcək: Allah, zinakarlara lə`nət etsin

:Həzrət Əli (ə) buyurur

Qiyamət günü Allahın əmrilə zinakar qəbirdən qalxanda dili lal, qulağı kar və gözü kor“ (olacaqdır.”(١

Həzrət Yaqub (ə) bu barədə oğlu Yusifə buyurmuşdur: “Ey oğul! Məbada sənə halal (olmayan qadınla zina edəsən. Çünki bir quş belə zina etsə bədəninin tükü tökülər.(٢

Peyğəmbəri-əkrəm (s) (şəhvət hissi ilə) naməhrəm qadınlarla əl tutub görüşmək :barədə buyurmuşdur

Əgər bir şəxs (şəhvət hissi ilə) naməhrəm qadınla əl tutub görüşsə, qiyamət günü“ Allahın əmrilə qəbirdən qalxanda əl-ayağı zəncirlənmiş olacaq. Həmin şəxsi şeytanla (birlikdə zəncirləyib, hər ikisini cəhənnəm oduna atacaqlar.”(٣

:Şəhvət üzündən naməhrəm qadınlarla söhbət etmək barədə buyurmuşdur

Naməhrəm qadınlarla (şəhvətlə) söhbət edən şəxsi, danışdığı hər bir kəlməsinin“ (əvəzində min il cəhənnəm odunda həbs edəcəklər.(٤

:Həmçinin başqa bir hədisdə naməhrəm qadınlara baxmaq haqqında buyurur

Naməhrəm qadınlara baxmaqdan doymayan şəxsin gözlərinə qiyamət günü dəmir“ .mismarlar vuracaqlar



---

.Həmin, c. ۵, səh. ١٩۴ [۵۵] -١

.Həmin mənbə, c. ۵, səh. ١٩۴ [۵۶] -٢

.Həmin mənbə, c. ۵, səh. ١٩۵ [۵٧] -٣

.Həmin mənbə, c. ۵, səh. ١٩۵ [۵٨] -۴

Həmin şəxs Allah-təala başqalarının əməl dəftərinə baxana qədər bu vəziyyətdə .qalacaq. Sonra Allahın əmrilə onu üzüqoylu cəhənnəm oduna atacaqlar

Saçlarını naməhrəmdən örtməyən və bu yolla kişiləri fəsada sürükləyən qadınlar :haqqında buyurur

Cəbrayılla (ə) birgə me`raca getdiyim gecə saçlarından asılmış bir qadın gördüm ki,“ beyni qaynayırdı. Cəbrayıldan (ə) onun hansı günah sahibi olduğunu soruşanda belə :cavab verdi

Bu saçlarını (və açıq-saçıq bədənini) naməhrəmdən qorumayan qadınlardan biridir. O“ .bu işi ilə bir çoxlarını günaha sürükləmişdir

## ZİNAKARIN CƏSƏDİNİ QƏBİR DƏ GÖTÜRMÜR

Belə nəql olunur ki, İmam Sadiqin (ə) dövründə zinakar bir qadın varmış. Bu qadın zina yolu ilə hamilə qalar, qohum-qardaşın onun bu çirkin əməlindən xəbər tutmaması .üçün dünyaya gətirdiyi uşaqları alova atıb yandırarmış

Yaxınlarından ancaq anası onun bu işini bilirdi. Bu qadın öləndə dəfn etmək üçün onun cənazəsini qəbristanlığa apardılar. Cənazəni qəbirə qoyanda torpaq onu geri atdı. Başqa bir qəbir qazıb qadının cənazəsini ora qoydular. Sonra üstünü torpaqla .basdırdılar. Bu dəfə də qəbir yarıldı və cənazə bayıra atıldı

O qadının yaxınlarından bir neçə nəfər İmam Sadiqin (ə) yanına gəlib baş verənləri ona nəql etdilər. İmam

Sadiq (ə) buyurdu: “Ölənin anasına xəbər verin gəlsin.” Bir az keçməmiş ölən qadının :anası gəldi. İmam (ə) üzünü ona tutub dedi

”?Sənin qızın sağlığında hansı günaha mürtəkib olmuşdur“

Qızın anası—mənim qızım zina ilə məşğul olar və başqaları onun bu pis əməlindən .xəbərdar olmasın deyə, zinadan doğulan uşaqları yandırardı– deyə ona cavab verdi

İmam Sadiq (ə) buyurdu: “Torpaq bu qadının cənazəsini götürməyəcək. Çünki bu qadın .Allah bəndələrini (uşaqları) Allaha xass olan əzabla (alovda yandırmaqla) cəzalandırıb

## ZİNANIN İYRƏNC AQİBƏTİ

Rəhmətlik Ayətullah Mirzə Çehelsütuninin oğlu Mirzə Məhəmmədəli Ağa belə nəql :edirdi

Xeyratxan mədrəsəsi yerləşən küçənin dalanında silah dükanı olan bir şəxs var idi.“ .Onun baş və boyun hissəsində çox böyük şiş peyda olmuşdu

Bir gün mən Şeyxlə(۱) birgə Noxudək kəndinə gedirdik. Həmin dükan sahibi də biz şəhərdən çıxdığımız vaxtdan arxamızca gəlirdi. O, bu cümləni yalvarışlı tərzdə elə hey :təkrar edirdi



---

(.Şeyx Həsənəli İsfahani (Noxudəki ləqəbiylə məşhur olan [۵۹] -۱

Ey Şeyx, ya mənə şəfa verin, ya da öldürün.” Elə ki, yolun yarısına çatdıq Şeyx geri“ .çönüb həmin adamın qulağına tərəf əyilib nə isə pıçıldadı

:Həmin şəxs uca səslə dedi

”!Qəbuldur, söz verirəm“

”.Şeyx buyurdu: “Bəs elə isə mən səni öldürəcəyəm

.Öldürün”– deyə dükan sahibi cavab verdi“

Şeyx atdan enib həmin adama bir qıraqda oturmağı tapşırdı. Sonra onun boyun dərisini bıçaqla azacıq kəsərək şişi sıxıb çıxartdı. Bıçağın enli hissəsiylə yaranın üstünü sığallamağa başladı. Yaranın yerindəki bütün çirklər axıb töküldü. Sonra yaranın .üstünə öz tüpürcəyi ilə sığal çəkdi

:Şeyx üzünü dükan sahibinə tutub dedi

”.Yaranın üstünü dəsmalla bağla, çıx get“

.Bir neçə gündən sonra yaranın yeri tamamilə sağalmışdı

Bu əhvalatdan artıq neçə il keçmişdi. Şeyx Həsənəli İsfahani rəhmətə gedəndən sonra bir dəfə həmin dükan sahibi ilə rastlaşdım. Mən həmin adamdan neçə il bundan əvvəl Şeyxin onun qulağına nə dediyini və dükan sahiibnin də “söz verirəm” deyə cavab :verməsini soruşanda, dedi

:Mən ərli qadınlarla zina edirdim. Elə buna görə də Şeyx mənə dedi“

Əgər bu əməlindən əl çəkəcəyinə söz versən, səni sağaldacağam. Amma yenə bu– ,günaha mürtəkib olsan

.sən yenidən xəstəliyə tutulacaq və elə bu xəstəlikdən də öləcəksən

Şeyx məni sağaldandan bir neçə il sonra şeytan yenə də məni vəsvəsə edib yoldan ".çıxardı. İndi çox yaxşı bilirəm ki, elə bu xəstəliklə də öləcəyəm

(Çox keçmədi dükan sahibi (ərli qadınlarla zina etdiyinə görə) həmin xəstəlikdən öldü.(۱)

### ŞƏHVƏT QULUNUN FACİƏLİ SONU

Həzrət Musa (ə) sitəmkarların diyarını fəth etmək qərarına gəlmişdi. O, Yuşə ibn Nun və öz kürəkəni Kalib ibn Yufnanın başçılığı altında böyük bir qoşunu həmin şəhərlərə göndərdi. Qoşun şəhərin mərkəzinə çatanda, yerli camaat Lut peyğəmbərin nəslindən :olan Bəl`əm Bauranın yanına gedib dedilər

Musa (ə) bizi bu şəhərdən çıxarmaq üçün böyük bir qoşun göndərmişdir. Bu hücumun" ".qarşısını almaq üçün onlara nifrin etməyi səndən xahiş edirik

Bəl`əm Baura, "İsmi-Ə`zəmi" çox gözəl bilirdi. O, üzünü ətrafına toplaşan camaata tutub dedi: "Mö`minlərin və mələklərin Musanın (ə) ətrafına toplaşdığı bir halda Allah "?peyğəmbərinə necə nifrin etmək olar

Şəhər camaatı öz dediklərindən əl çəkmir, Bəl`əm Baura isə onların xahişini rədd edirdi. Axırda şəhər ağsaqqallarından bir neçə nəfər qiymətli hədiyyələrlə

səh:۱۱۶

---

.Nişan əz bi nişanha", səh, ۹۶" [۶۰] -۱

Bauranın arvadının yanına gedib, ərini (Bauranı) bu işə (Musaya (ə) və onun qövmünə nifrin etməyi) razı salmağı xahiş edirlər. Qadın gətirilən hədiyyələri qəbul edib bu işə .əncam qılacağını söz verir

Bəl`əm Bauranın arvadı öz ərinə bu haqda söz açanda o yenə də razı olmadı. Arvadının əl çəkməyəcəyini görən Baura Allahla məşvərət (istixarə) etmək qərarına gəlir və Allahdan bu işdə ona yol göstərməsini istəyir. Yuxuda ona bu işi görməyi (nifrin etmək) qadağan edirlər. Baura istixarəsinin cavabını arvadına deyəndə qadın əl çəkməyib ondan ikinci dəfə istixarə etməsini istəyir. Amma Bəl`əmin ikinci istixarəsi .cavabsız qalır

Sonda arvadının yağlı dilinə aldanan Baura bu işi görməyə razılıq verir. Bəl`əm eşşəyə minib Musa (ə) və onun qövmünə nifrin etmək üçün Bəni-İsrail yaşayan məntəqəyə yaxın olan dağa üz tutdu. Dağa yaxınlaşdığı vaxt eşşək yerindən tərpənmir. O, zavallı heyvanı o ki, var döyür. Eşşək bir az yol gedib yenə də dayanır. Bəl`əm üçüncü dəfə :eşşəyi döyəndə Allah-təala dilsiz heyvanı dilə gətirib danışdırır

”?Vay olsun sənə ey Bəl`əm! Məgər görmürsənmi ki, mələklər məni geri qaytarır“

Zavallı heyvan elə oradaca ölür. Bəl`əm isə piyada yoluna davam edir. Bəni-İsrail yaşayan məntəqəyə çatdıqda Musa (ə) və onun qövmünə nifrin etmək istədi. Amma dilinə duadan başqa bir kəlam gəlmədi. Əksinə, öz şəhər camaatına dua etmək istəyəndə dilinə ancaq

nifrin gəldi. Ondan bu haqda soruşanda belə cavab verir: Allah-təala bizi imtahana çəkməklə alçaltdı. Elə bu vaxt susuz itlər kimi dili çölə sallandı. O, bu görkəmindən də :ibrət almayıb dedi

Artıq dünya və axirətim əldən getdi. İndi isə hiyləgərlikdən başqa çıxış yolu yoxdur."" Onun əmrilə şəhərin bütün qadınlarını zinət əşyalarıyla bəzəyib, alış-veriş adıyla Həzrət Musanın (ə) qoşununa tərəf göndərdilər. Həmçinin, qadınlara onlarla cinsi əlaqədə olmaq istəyən əsgərlərə mane olmamaq tapşırığı verilmişdi. Bəl`əmin dediyinə görə əgər Musanın (ə) qoşunundakı əsgərlərdən heç olmasa biri zina etsə, bu .onların sonu demək idi

Bəl`əmin tapşırığıyla qadınlar qoşunun içə-risində gəzib dolaşmağa başladılar. Züməri :ibn Məşlum həmin qadınlardan birini Musanın (ə) yanına gətirib deyir

Belə fikirləşirəm ki, bu qadınla yaxınlıq etməyin mənə haram olduğunu deyəcəksən." Amma and olsun Allaha, bu işdə sənə itaət etməyəcəyəm." Sonra həmin qadını öz .xeyməsinə aparıb onunla yaxınlıq edir

Bu günahın (zina) əvəzində Allah-təala Musanın (ə) qoşununu taun xəstəliyinə düçar etdi. Musanın qoşununa rəhbərlik edən Harun oğlu Fənhas ibn İzar həmin vaxt orada olmamışdı. Qayıdarkən qoşundakı bütün əsgərlərin ölümcül taun xəstəliinə tutulduğunu görən Fənhas ibn İzar bunun səbəbini soruşanda, baş verənlər haqqında ona danışırlar. O, çox qeyrətli və şücaətli bir

adam idi. Zumərinin xeyməsinə gedəndə artıq onun (Züməri) həmin qadınla qanunsuz .yaxınlıq etdiyini görür. Fənhas onların hər ikisini bir nizə ilə öldürür

Həmin saata qədər Musanın (ə) qoşunundakı ٢٠ min əsgərin bu xəstəliyə yoluxaraq ölməsinə baxmayaraq, Zumərinin ölümündən sonra taun tamamilə aradan gedir. :Allah-təala Bəl`əm Baura haqqında bu ayəni nazil etdi

Onlara öz sirlərimizi (İsmi-ə`zəmi) öyrətdiyimiz adamın əhvalatını danış ki, bizim“ itaətimizdən çıxdığı üçün verdiyimizi ondan geri aldıq və şeytan onu tamamilə (yolundan azdırdı.”(١

Həzrət İsa (ə) buyurmuşdur: “Naməhrəm qadınlara baxmaqdan pərhiz edin (çəkinin). Çünki bu əməl şəhvət odunun alovlanmasına və sonda insanın həlakət uçrumuna (yuvarlanmasına səbəb olur.(٢

## ŞORGÖZLƏR HAQQINDA

Şorgözlərin aqibətindən söz açmazdan əvvəl burada naməhrəmə baxmaq haqqında .nəql olunan bir neçə hədisi qeyd etməyimizi lazım bildik



---

.Biharül-ənvar”, ١٣-cü cild, səh. ٣٧٣“ [۶١] -١
.Mizanul-hikmət”, ١٠-cu cild, səh. ٧١“ [۶٢] -٢

Peyğəmbər (s) buyurur: “Allah-təala qiyamət günü gözlərini naməhrəm qadına-١ baxmaqla doyduran şəxsin gözlərini alovla dolduracaq.”(١)

İmam Sadiq (ə) buyurmuşdur: “İblisin zəhərli oxlarından biri də naməhrəmə-٢ baxmaqdır ki, heç vaxt boşa getməz. Çox vaxt haram nəzərlərin ardınca uzun-uzadı həsrət gəlir.(٢)

Həmçinin İsa (ə) bu barədə buyurub: “Naməhrəmə baxmaqdan çəkinin. Çünki-٣ naməhrəmə baxan şəxsin qəlbində şəhvət oyanır. Bu da insanın haram yola getməsinə kifayət edir.”(٣)

Bu bölümdə müsəlman cavanlarımıza ibrət olsun deyə şorgözlərdən bir neçəsinin .aqibətini qeyd edirik

## ŞORGÖZLƏRİN ÜZÜ

Bə`zən şorgöz şəxs elə bir həddə çatır ki, özünü saxlaya bilmir. Hətta ona bu halda .zərbə vursalar belə hiss etməz

:İmam Baqirdən (ə) belə bir rəvayət nəql olunmuşdur

Mədinəli cavan oğlan yolda bir qadınla rast-laşır. (Həmin vaxtlar qadınlar baş örtüklərini qulaqlarının arxasından bağlayırdılar. Bu halda boyun və sinənin bir hissəsi (.açıqda qalırdı



---

.Əmali”, Şeyx Səduq, səh. ۴٢٩; “Biharül-ənvar”, c. ١٠۴, səh. ٣٢“ [۶٣] -١

.Məhasini-Bərqi”, səh. ١٠٩; “Biharül-ənvar”, c. ١٠۴, səh. ۴٠“ [۶۴] -٢

.Biharul-ənvar, c. ٣٢۵; “Səfinətül-bihar”, c. ٨, səh. ٢٨٣ [۶۵] -٣

Qadının açıq boyun-boğazını görən cavan oğlan diqqətini ondan çəkə bilmədi. Cavan oğlan gedə-gedə qadının ardınca baxırdı. O, belə bir halda ensiz dar bir küçəyə daxil oldu. O, qadını sanki öz nəzərləri ilə müşayiət edirdi. Elə bu vaxt oğlanın üzü divara dəydi. Divardakı iti bir daş qırığı onun üzünü parçaladı. Beləliklə, o bu haram əməlinin .cəzasını aldı

Qadın artıq onun gözləri önündən yox olandan sonra cavan oğlan bir an özünə gəldi. :Elə bu vaxt üzündən qan axdığını və üst-başının qana bulaşdığını görüb öz-özünə dedi

.And olsun Allaha! Peyğəmbərin (s) yanına gedib bu macəranı ona danışacağam

?Peyğəmbər (s) cavan oğlanın üz-gözünü qanlı görüb soruşdu: Nə olub? Bu nə haldır

.Oğlan başına gələnləri Peyğəmbərə (s) danışdı

Elə bu vaxt Cəbrayıl (ə) Allah tərəfindən nazil olub “Mö`minlər” surəsinin ٣٠ və ٣١-ci ayələrini Peyğəmbərə (s) nazil etdi: “Şübhəsiz ki, bunda (insanlar üçün) ibrətlər vardır. Həqiqətən, Biz (bəla, müsibət göndərməklə bəndələrimizi) imtahana çəkirik! Onlardan ”.sonra başqa bir nəsil yaratdıq

## (ƏMƏLLƏRİN CƏZASINDAN QAFİL OLMA (١

Nəql olunur ki, Buxara şəhərində su satan bir kişi vardı. Bu kişi neçə illər idi ki, bir zərgərin evinə su gətirərdi. Həmin müddət ərzində o, zərgərin ailəsinə heç vaxt .xəyanət gözü ilə baxmamışdı

Amma günlərin birində yenə həmişəki kimi zərgərin evinə su gətirdiyi vaxt məşkin (su tuluğu) suyunu boşaldandan sonra birdən zərgərin arvadının biləyindən tutub onu .öpməyə başlayır, birdən nə isə fikirləşir və qadını buraxıb oradan uzaqlaşır

Axşam zərgər kişi evə qayıdanda arvadı həmin gün bazarda nə baş verdiyi haqqında ondan soruşur. Kişi əvvəlcə həqiqəti deməyə çəkinir. Qadının çox israr etdiyini görüb düzünü deməyə başlayır. Bu gün dükana bir qadın gəlmişdi. Qabaqcadan sifariş verdiyi qolbağı biləyinə taxanda birdən gözüm qoluna sataşdı. Elə bu vaxt özümü saxlaya bilməyib onu öpməyə başladım; amma birdən böyük bir günaha düçar olduğumu fikirləşib onu özümdən uzaqlaşdırdım. Zərgərin arvadı bunu eşidən kimi (təkbir deyərək, su satan kişinin bu günkü əhvalatını ərinə danışır.(١



---

.Xəzinətül-cəvahir”, səh. ١٨٠“ [۶۶]-١

## (ƏMƏLLƏRİN CƏZASINDAN QAFİL OLMA (۲

Belə rəvayət edilir. Həzrət Davudun (ə) dövründə fasiq bir kişi varmış. Günlərin birində bu fasiq kişi yoxsul birinin arvadıyla yaxınlıq edir. Qadınla əlaqədə olduğu vaxt başqa bir kişinin onun arvadıyla zina etdiyi gözləri önünə gəlir. Həmin fasiq kişi tez evinə dönür. Arvadının doğrudan da yad kişi ilə zina etdiyini görür. Kişini cəzalandırmaq üçün .Davudun (ə) yanına aparır

Allah-təala tərəfindən Davuda (ə) bu şəxs haqqında vəhy nazil olur: "O şəxsə de ki, nə əkərsən, onu da biçərsən. Sən başqasının arvadıyla zina etdin, başqa birisi də sənin ".arvadınla

Hədislərin birində belə nəql olunur: "Əgər bir şəxs zina etsə, qarşılıqlı əvəzini görər. (Arvadı varsa ona, yoxsa, övladlarına təcavüz edilər. (zina olunar)(۱

Üsuli-kafi kitabında buna oxşar rəvayət nəql olunmuşdur. Belə bir əhvalat Musa (ə) peyğəmbərin də dövründə baş vermişdir. Sonra Cəbrayıl (ə) Musa (ə) peyğəmbərə :nazil olub ərz edir

Onlara de: "Hər kim zina etsə, bir gün onun öz namusu (ana və ya bacısı, qızı) ilə də" ".zina ediləcəkdir

səh:۱۲۳

---

.Əl`ənvarun-nə`maniyə", səh. ۳۴۲" [۶۷] -۱

## ŞORGÖZLÜYÜN AQİBƏTİ

Xəlifə Mö`təsimin (Abbasi xəlifəsi) vəzirlərindən biri özü üçün hündür bir saray tikdirmişdi. Bu saraydan ətraf evləri açıq-aydın görmək olurdu. Vəzir öz sarayında oturub qapı-bacadan oğrun-oğrun qonşu qız-gəlinlərinə baxardı. Bir gün təsadüfən qonşuluqdakı gözəl bir qız onu valeh etdi. Bu qız çox gözəl əndamı və şux qaməti ilə .sanki vəziri ovsunlamışdı. Vəzir qızı görüb, aşiq olur

Bir nəfəri qızın atasının yanına elçiliyə göndərir. Qızın atası tacir idi. O vəzirin təklifini rədd edərək deyir: “Biz vəzirin şə`nində deyilik və gərək özümüz kimi birisi ilə (tacir) ”.qohum olaq

Eşq alovuyla yanan vəzir əlacsız qalıb sirrini yaxın adamlarından birinə danışır. Həmin şəxs onu bu sevdaya qovuşdurmaq üçün min dinar pul istəyir. Sonra qazinin yanında inanılmış şəxslərdən on nəfər tapıb bir yerə yığır, onların hər birinə ۱۰۰ dinar verib .bunun əvəzində tacirin qızının vəzirin kəibnlisi olduğuna şəhadət verməlrini istəyir

Yalançı şahidlər qazinin yanına gedib vəzirin tacir qızıyla kəibnli olmasına şəhadət verirlər. Onlar bu işi vəzirin canı təhlükədə olduğuna görə, qızı və atasını başı uca .etmək üçün gördüklərini vurğulayırlar

Bu mərasim başa çatdıqdan sonra vəzir arvadını gətirmək üçün bir nəfəri tacirin evinə .göndərir

səh:۱۲۴

.Məsələnin nə yerdə olduğunu bilməyən tacir vəzirlə birlikdə qazinin yanına yollanır

Qazinin rə`yinə əsasən vəzir qızın mehriyəsini atasına (tacirə) verib, arvadını evinə aparmalı idi. Bütün baş verənlərə mat-məəttəl qalan tacirin az qala başına hava .gələcəkdi

Tacir şikayət etmək üçün xəlifə Mö`təsimin hüzuruna getmək qərarına gəlir. Amma xəlifənin hüzuruna getmək asanlıqla düzələn bir iş deyildi. Dostlarından birinin məsləhətinə görə çıxış yolu ancaq saray adamlarının libasını geyinib xəlifənin .hüzuruna getmək idi

Tacir, dostunun dediyi kimi saray adamlarından birinin libasını geyinib özünü xəlifə .Mö`təsimə çatdırır. O, başına gələnlərin hamısını xəlvətcə xəlifə üçün nəql edir

Xəlifə vəziri hüzuruna çağıtdırdı. Vəzir işin nə yerdə olduğunu artıq başa düşmüşdü. Bütün olanları doğru-düzgün danışmaqla xəlifənin onu bağışlayacağını sanan vəzir, tam yanılmışdı. Çünki, o tacirin qızı üçün çoxlu mehriyə tə`yin etmişdi və şahidlər də bunu təsdiq edirdilər. Onlardan hər biri öz günahını e`tiraf edəndən sonra, Mö`təsim şahidlərin onunu da saray önündə dar ağacından asmalarını əmr edir. Xəlifənin əmri ilə vəziri təzə kəsilmiş inəyin dərisinə büküb dəmir əmudla o ki var vurdular. Onun .bütün sümükləri ovulub bir-birinə qarışdı

Mö`təsim əmr etdi ki, tacir qızını evə aparsın və vəzirin qız üçün tə`yin etdiyi mehriyəni mənimsəməkdə heç kimin onu qınamağa haqqı yoxdur.(1)

Peyğəmbər buyurmuşdur: "Küçədən ötərkən başqasının evinə boylanaraq qadın kişinin bədəninə və ya kişi də qadının saçlarına nəzər salsa, belə bir adamı qiyamət günü münafiqlərlə məşhur etmək Allah-təalaya vacib olur. Həmin şəxsi Allah-təala bu dünyada rüsvay etməmiş öldürməz və qiyamət günü o şəxs çılpaq şəkildə məşhur olacaqdır. Bu dünyada öz çirkin adəti üzrə naməhrəmə baxmaqdan usanmayan adamın gözlərinə alovdan düzəldilmiş mıxlar sancılacaq, sonra isə Allahın qəzəb alovuna atılacaqdır."(2)

## ŞORGÖZÜ ÇUVALA SALDILAR

Nəql olunur ki, Mö`təsim Abbasinin xilafəti dövründə yaşayan mö`min bir dərzi varmış. O, hər gün öz dükanının yaxınlığındakı məsciddə azan deyərdi. (Digər Abbasi xəlifələrindən fərqli olaraq, Mö`təsim Abbasinin xəlifəlik etdiyi dövrdə dövlət və idarəetmə işləri nisbətən yaxşı idi.)

Haqqında söz açdığımız bu dərzi kişi günlərin birində namazdan sonra məsciddən çıxarkən Mö`təsim Abbasinin



---

1- [68] "Şeytanşinasi", səh, 24.

2- [69] "İqabül-ə`mal", səh, 45.

məmurlarından biri ilə rastlaşır. Bu iri cüssəli və qorxulu heybəti olan əmir beş min .döyüşçüyə rəhbərlik edirdi

Şərabın tə`sirindən ağlı başında olmayan əmir küçədə bir qadının çadrasından tutub, çəkə-çəkə öz evinə aparırdı. Zavallı qadın nə qədər qışqırıb: “Ay camaat! Mən namussuz qadın deyiləm. Filankəsin qızı və filankəsin arvadıyam. Evim də filan məhəllədədir. Əgər bu gecə evə getməsəm ərim məni boşayacaq.” desə də .bədheybət əmirin qorxusundan kimsə yazıq qadının sözlərinə əhəmiyyət vermirdi

Dərzi kişi deyir: İrəli keçib haray-həşir salmağa başladım. Amma o biqeyrətə heç bir söz tə`sir etmirdi. Vicdanım bu haqsızlığa göz yummağa imkan vermirdi. Ona görə də şəhərin ağsaqqal və böyükləri ilə yığışıb həmin əmirin qapısına getdik. Onun evinin :qabağında hay-küy salıb dedik

Məgər bu şəhərdə bir müsəlman qalmayıb ki, günün-günorta vaxtı xəlifənin sarayının“ önündə namuslu bir qadının abır-həyasını ayaq altına ataraq öz evinə aparırsan? Səninçün çox yaxşı olar ki, o qadını elə bu dəqiqə evinə buraxasan. Yoxsa elə bu ”.dəqiqə xəlifə Mö`təsim Abbasinin yanına gedib səndən şikayət edəcəyik

Bu sözləri eşidəndə əmir əsəbiləşib əlindəki böyük bir çomaqla bizim üstümüzə cumdu. .Birinin başı, birinin qolu və digərinin ayağı sındı

Vəziyyəti belə görəndə hamımız oradan qaçdıq. Məscidə gedib xiftən namazını qılandan sonra evə qayıtdım. Yatağa uzandım. Amma nigarançılıqdan gözümə yuxu getmədi. Düşünürdüm ki, bu gecə həmin qadın evinə getməsə, sabah əri onu mütləq boşayacaq. Eşitdiyimə görə içki içən adam məst halda tez yuxuya gedir. Yuxudan ayılanda gecədən nə qədər keçdiyini bilmir. Məscidə gedib əzan verməyi düşündüm. Çünki əmir əzan səsini eşidəndə sübh olduğunu güman edib, qadını buraxacaq. Qadın əmirin evindən çıxanda mən məscidin önündə onu gözləyərəm. Onu tez evinə çatdıraram ki, əri onu boşamasın. Təsadüfən həmin gecə xəlifə oyaq olur. Azan səsini eşidəndə çox əsəbiləşir və deyir: Vaxtsız azan deyən kəs fasid adamdır. Çünki azan səsini eşidən hər bir şəxs sübh namazının vaxtı olduğunu güman edəcəkdir. Namaz qılmaq üçün evdən çıxanda gecə qaravulları onu saxlayıb sorğu-sual edəcəklər. Xəlifə qulluqçularından birini çağırıb deyir: “Get qapıçıya de ki, azan verən şəxsi mənim hüzuruma gətirsin. Gərək ona elə bir dərs verəm ki, bir də yersiz əzan verməsin.”

Dərzi kişi deyir: “Azanı deyib qurtarandan sonra məscidin qapısında dayanıb həmin qadının o alçaq əmirin evindən çıxmasını gözləyirdim. Elə bu vaxt xəlifənin qapıçısının əlində məş`əl mənə tərəf gəldiyini gördüm.

Qapıçı məni görüb soruşdu: “Azan verən sən idin? Heç bilirsən ki, bu işinlə xəlifənin .narahatçılığına səbəb olmusan? Xəlifə məni sənin dalınca göndərib

Bəli, vaxtsız azan deyən mən idim. Xəlifə narahat olmağa çox haqlıdır. Amma məni“– .bu işə əxlaqsız və heysiyyətsiz bir şəxs vadar etmişdir”–deyə cavab verdim

?Qapıçı dedi: Söylədiyin əxlaqsız və heysiyyətsiz adam kimdir

”.Dedim: “O, çox alçağın birisidir, nə Allahdan qorxur və nə də xəlifədən

.O kimdir ki, nə Allahdan qorxmur və nə də xəlifədən”–deyə qapıçı təəccüblə soruşdu“

Dedim: Bunu ancaq xəlifənin hüzurunda deyəcəyəm. O zaman mə`lum olacaq ki, mən yersiz azan vermişəm, yoxsa yerində. Saray xidmətçisi ilə birlikdə xəlifənin hüzuruna getdik. Öncə xidmətçi içəri girib xəlifəyə nə isə dedi. Xəlifənin əmri ilə məni içəri .çağırdılar

?Xəlifə üzünü mənə tutub dedi: De görüm vaxtsız azan verməyinin səbəbi nədir

Mən sərxoş əmirin namuslu qadının başına gətirdiklərini, onun bu iyrənc əməlinə e`tiraz edənləri döyməsini və mənim vaxtsız azan verməyimin əsas səbəbini ”.bütünlüklə nəql etdim

Xəlifə məni dinləyəndən sonra saray xidmətçisinə dedi: Get qapıçıya de ki, bir neçə mə`murla birlikdə filan əmirin evinə gedib, onu mənim hüzuruma gətirsinlər. Desinlər ki, xəlifənin səninlə tə`cili işi var. Həmçinin

dünən axşamçağı evinə apardığı qadını da özü ilə gətirsin. Qadını evdən çıxaranda şəhər mö`təmidlərindən bir neçəsi onu evinə aparıb, ərinə desinlər: Xəlifənin sənə xüsusi salamı var və bu qadına zamin durub deyir: O, günahsızdır və bundan sonra ”.onunla daha da mehriban davran

Əmiri isə mənim yanıma gətirin. Xəlifə üzünü dərziyə tutub deyir: “Hələlik sən də ”.burada qalsan yaxşı olar

Xəlifənin tapşırığına əsasən mə`murlar əmiri saraya gətirdilər. Xəlifə əmiri görəndə :dedi

Müsəlmanlardan bir qrupu rumlulara əsir düşəndə, onlara kömək etmək üçün“ Bağdaddan Ruma gedib düşmən qoşununu məğlub etdim. Çıxılmaz vəziyyətdə qalan Rum padşahı qaçmağa məcbur oldu. Altı il həmin diyarda qaldım. Müsəlman ordusu hətta Konstantinopola qədər irəliləmişdi. Mən Rumda böyük bir məscid də tikdirdim. Hal-hazırda orada qurdla-quzu birlikdə su içirlər. Yə`ni sülh və əminamanlıq içində .yaşayırlar

Sonra əlavə etdi: Ey xain əmir! Yə`ni sən o qədər qudurmusan ki, Bağdadda, mənim qulağımın diibndə, zorla bir qadını evinə aparıb haram iş görmək istəyirsən? Camaat ?bu pis işinə görə sənə xəbərdarlıq edəndə də vurub onların əl-ayağını qırırsan

Xəlifənin əmri ilə xain əmiri bir kisəyə salıb, ağzını möhkəm bağladılar. İki mə`mur əllərindəki böyük çomaqlarla kisənin içindəki əmiri o qədər vurdular ki, əti

ilə sümüyü əzilib bir-birinə qarışdı. Sonra əmirin əzilmiş bədənini elə kisənin içində .Dəclə çayına atdılar

:Xəlifə üzünü dərzi kişiyə tutub dedi

Ey ağsaqqal! Hər vaxt Allahdan qorxub çəkinməyən, camaata zülm edən və İslam“ dininə xəyanət edən birini görsən, məscidin minarəsinə çıxıb, vaxtsız azan ver ki, mən .də eşidim. Bu vasitə ilə səni çağırtdırıb baş verənlərdən xəbərdar olum

## TƏQVA VƏ TƏVƏKKÜL HAQQINDA

### TƏVƏKKÜLÜN İNSAN HƏYATINDA ROLU

Təvəkkülün insan həyatındakı əhəmiyyətli rolunu, təvəkkül haqqında yanlış fikirlərin .ortaya çıxdığını nəzərə alaraq, bu barədə söz açmağı lazım bilirik

Təvəkkül “vəkalət” sözündən götürülmüşdür. İslam ensiklopediyasında təvəkkül, insanın Allahı özünə güvəncli bir arxa qərar verməsinə deyilir. Yə`ni insan Allahı vəkil tutaraq bütün işlərini Ona tapşırır. Rəvayətlərin birində göstərilir ki, Peyğəmbər (s) Cəbrayıldan (ə) Allaha təvəkkül barəsində soruşdu. Cəbrayıl (ə) cavabında dedi: “Təvəkkül, insanın yaradılmışın ona bir ziyan və xeyir yetirməməsinə, bir şey bağışlayıb, ondan bir şey almamasına olan elmidir. Həmçinin, təvəkkül insanın xəlqdən (yaradılmışdan) mə`yus olub əlini üzməsidir. Elə ki, bəndə bunu dərk etdi, Allahdan qeyrisi üçün iş görməz, Ondan qeyrisinə bel bağlamaz, ondan özgəsinə əl açmaz. Bu (Allaha təvəkkülün mə`nasıdır.”(۱

Qur`ani-kərimdə təvəkkül haqqında çoxlu ayələr mövcuddur ki, o cümlədən, bu ayəni :misal göstərmək olar

(Gərək mö`minlər (hər işdə) Allaha təvəkkül etsinlər!”(۲...“

.Bu ayədə Allah təvəkkülü imanın ayrılmaz bir hissəsi kimi təqdim edir

səh:۱۳۴

---

.Bihar”, c. ۱۷, s. ۱۳۸“ [۷۰] -۱

.Ali-İmran”, ۱۲۲“ [۷۱] -۲

İnsan müsbət nəticələr əldə etsin deyə, dünyəvi işlərində özünə vəkil seçdiyi kimi, əksər işlərini onun ixtiyarına verdiyi kimi, yaxşı olardı bir Allah bəndəsi olaraq bütün işlərində Allaha arxalanıb, öz işinə Onu vəkil tutardı. Bununla o, onu sıxan, darıxdıran əksər iztirablardan yaxa qurtarmış olardı. Başqa sözlə desək, öz ehtiyaclarını tə`min :etmək istəyən kəsin qarşısında üç yol vardır

;Öz gücünə e`timad etmək.١

;Başqalarına güvənmək, onların köməyinə göz dikmək .٢

.Allaha arxalanıb, Ondan qeyrisinin köməyinə göz yummaq.٣

Burada insanın Allaha təvəkkülü, Allahın rübubiyyətini dərk etməsindən qaynaqlanır. Çünki, insan Allahı tam ixtiyar sahibi olaraq tanıyarsa, artıq başqasının qapısına getməyə, Allahdan qeyrisinə əl açmağa ehtiyac görmür. Həzrət Əli (ə) dualarının birində deyir: “İlahi! Sən dostlarına [başqalarından daha] yaxınsan. Sənə təvəkkül edənlərin işlərini yoluna qoymaq üçün onların özündən daha çox hüzura maliksən. Onların sirlərindən xəbərdarsan, fikirlərindən keçənlərə agahsan, baxışlarının ”.hüdudlarını bilirsən

Davamında buyurur: “[Dostlarının qəlblərində gəzdirdikləri] sirləri sənin yanında aşkardır, Səni görmək həsrəti ilə qəlbləri qandır. Əgər tənhalıq onları sıxsa, dəhşətə gəlsələr, Səni yad etməklə təskinlik tapar, müsibətlərə tuş gəlsələr sənə pənah gətirər, dərgahına üz

(tutarlar. Onlar bilirlər ki, bütün işlərin ixtiyarı Sənin əlindədir."(١

İmam Baqir (ə) Allaha təvəkkül etməyin faydası haqqında buyurur: "Allaha təvəkkül edən kəs məğlub olmaz, Ona pənah aparan şəxs yenilməz."(٢)

Allaha iman və təvəkkül əksər peyğəmbərlərin də`vətinin sərlövhəsində yer almışdır. Bu üzdən Allaha imanın nişanələrindən biri Ona təvəkkül etməkdir.

Təvəkkül xarici rəftar olmayıb qəlbi işlərdən hesab olunur. Buna görə də təvəkkülü işdən-gücdən əl çəkib tənhalığa qapılmaq, səhərdən axşama kimi ibadət edəcəyim təqdirdə Allah da mənim ruzimi yetirəcək deyib işdən boyun qaçırmaq kimi başa düşməməliyik. Şübhəsiz bu fikir kökündən yanlışdır. Bu yolu tutub gedənlər səhv istiqamətdə hərəkət edirlər. Rəvayətlərin birində deyilir: "Peyğəmbər (s) bir dəstə camaatı bekar oturan gördü. Onlara dedi: "Siz kimsiniz?" Dedilər: "Biz təvəkkül edənlərik." Həzrət (s) cavablarında buyurdu: "Yox, elə deyil. Siz başqalarına artıq yüklərsiniz."(٣)

İslam maarifindən yetərincə xəbəri olmayanlar elə bilirlər ki, təvəkkül maddi imkanlardan imtina etməkdir. Onların fikrincə, əgər kimsə maddi imkanlardan istifadə edirsə, deməli onun Allaha təvəkkülü yoxdur. Əslində təvəkküllün yoxluğu nə maddi ne`mətlərdən istifadə edən kəslə bağlıdır, nə də təvəkkülə malik olmaq bir kəsin



---

١- [٧٢] "Nəhcül-bəlağə", xütbə-٢١٨, s. ٧١٩.

٢- [٧٣] "Müstədrəkül-vəsail", c. ١١, səh. ٢١٧.

٣- [٧۴] "Müstədrəkül-vəsail", c. ١١, s. ٢١٧.

maddi ne`mətlərdən imtina etməsi ilə əlaqədardır. Elə tənbəl insanlar var ki, “ver yeyim, ört yatım, gözlə canım çıxmasın” deyib, gözlərini bir tikə çörəyə dikərək yerlərindən tərpənmirlər. Belələrinin iş görməyə halları da olmur. Onlardan soruşanda ki, niyə işləmirsən, deyirlər: “Biz Allaha təvəkkül edirik. Ruzi Onun əlindədir, Allah Özü ”!ruzimizi yetirəcək

Həqiqətdə bu söz onların tənbəlliklərini pərdələyən zahiri bir örtükdür. Əslində onların .Allaha təvəkkülü yoxdur, yalan deyirlər. Əlbəttə, təvəkkülü olan insanlar da olur

Qeyd etdiyimiz kimi, təvəkkül qəlbi bir işdir və Allaha arxalanmaq mə`nasınadır. Yə`ni insan qəlbində Allaha arxalanıb. Bu baxımdan, ola bilsin insan təvəkkülün ən ali dərəcəsinə çatsın və eyni halda Allahın buyruğuna əsaslanaraq maddi ne`mətlərdən də istifadə etsin. Mümkündür ki, belə bir kəs hamıdın çox işləsin, işə hər kəsdən daha ciddi yanaşsın, amma bununla belə öz işindən daha çox Allaha e`timad etsin. Ümumiyyətlə Allahın tənbəl, bekar insandan xoşu gəlmir. Allah insana vəzifəsi olaraq zəhmət çəkməyi, işlə məşğul olmağı buyurmuşdur. Çünki ilahi hikmət bu dünyanın işlərinin səbəblər silsiləsi ilə hərəkət etməsini vacib edir. Allahı tanıyan kəs bilir ki, dünya işləri ilahi hikmətin tələibnə müvafiq olaraq səbəblər vasitəsilə həyata keçir. İnsanın təkamülü həmin sistemin dərkinə bağlıdır. Məhz həmin sistemin vasitəsilə insan imtahana çəkilir. Belə olmazsa insan təkamüldən qalar. İnsanın təkamülü bəndəlik

vəzifələrinin yerinə yetirilməsi ilə müəyyənləşir. Bəndəliyin özü də insanlıq əlaqələri ilə səciyyələnir. Nəhayət, insanlıq əlaqələri də öz növbəsində səbəblər sistemində dərc .edilmişdir

Beləliklə, insan tənhalığa çəkilib, ancaq ibadətlə məşğul olsa və gündəlik həyatında bir işdən yapışmasa, ilahi hikmətin əksinə əməl etmişdir. Belə olan surətdə, onun Allahdan .ruzi gözləməsi əbəsdir

:Mövlana demişkən

Gər təvəkkül edəcəksən, iş gör, qalx erkən

.Əvvəl ək, becər, sonra Cabbara söykən

Buna görə də ilahi hikmət insanın öz istəklərinə çatması, ehtiyaclarını tə`min etməsi üçün Allahın xəlq etdiyi vasitələrdən yararlanmasını zəruri edir. Əgər Allahdan quru xahiş etməklə insanın ruzisi yetişsəydi, onda kimsə ruzi dalınca getməz və insanlar imtahan olunmazdı. Deyəndə ki, hədəfinə çatmaq üçün Allahın qərar verdiyi vasitələrdən istifadə et, bu, o demək deyil ki, sənin ruzi verənin torpaqdır, ya işdir və ya digər səbəblərdir. Bunların hamısı Allah tərəfindən verilmişdir. Ruzinin özü də Allahın əlindədir. Sənin vəzifən

səbəblərin dalınca getməkdir. Bununla ilahi hədəflər dünya sistemində həyata keçmiş .olur

Deməli, təvəkkül edən işdən, zəhmətdən yayınmamalıdır, təvəkkül etməyənlər tənbəlliyə qurşanırlar. Bu iki dəstənin fərqi, onların qəlbi bağlılıqlarındadır. Təvəkkül edən, Allaha itaət niyyətilə Allaha söykənib ümid edərək iş görür, amma əqidəsiz, təvəkkül etməyən kəs öz ruzisini işdə çalışmaqda və ya başqasının əlində axtarır. Mö`min Allahdan başqa heç kimə ümid etmir. O bütün olanları Allahdan bilir. Əgər əli bütün səbəblərdən üzülsə, onun Allaha olan ümid çırağı zəifləmir. Çünki Allah tərəfindən bəndəyə çatan hər bir işin hikmətə əsaslandığını, onun xeyrinə olduğunu .dərk edir. Allah heç vaxt Öz bəndəsini onun xeyrinə olan işdən məhrum etməz

Mə`lum məsələdir ki, dünya mexanizmi səbəblər sisteminin əsasında formalaşır və insan da həmin sistemin zəncirvari bağlılığında onun bir halqası olaraq öz istəklərinə çatması üçün iş görməlidir. Başqa bir tərəfdən iş görmək, başqaları ilə ünsiyyətdə olmaq insanın imtahana çəkilməsinə şərait yaradır. Çünki insan imtahan olunmasa təkamülə üz tutmaz. İnsan cəmiyyətə qatılıb müxtəlif şəraitlərə düşməklə bərkdən-boşdan çıxır, insanlarla ünsiyyətdə qarşılıqlı hüquqlara riayət etməklə öz təkamülünə .zəmin yaradır

Deyirlər bir gün həzrət Musa (ə) xəstələnir. Bəni-İsrailin böyükləri ona baş çəkməyə .gedirlər və deyirlər: “Əgər filan otu dəmləyib suyunu içsən sağalacaqsan

Həzrət Musa (ə) deyir: “Müalicəyə ehtiyac görmürəm, Allah Özü mənə şəfa verəcəkdir!” Həzrət Musa (ə) bir müddət bu halla yaşayır, amma özündə yaxşılığa doğru bir irəliləyiş hiss etmir. Axırı Allah ona vəhy göndərir ki, izzət və cəlalıma and .olsun, sənə deyilən otla özünü müalicə etməyənə qədər sənə şəfa verən deyiləm

Həzrət Musa (ə) həmin otdan istifadə edəndən sonra sağalır, amma Bəni-İsrailə dediyi sözə görə qorxuya düşür. Yenə də Allahdan ona xitab gəlir: “Ey Musa, sən öz [yanlış] təvəkkülünlə bizim hikmətimizi batil etmək istəyirdin? Otların kökündə şəfabəxş ?tə`sirləri, min bir dərdə dərman olan faydalı xüsusiyyətləri qoyan kimdir

Hədislərin birində deyilir ki, zahidlərdən biri şəhərdən çıxıb dağların qoynunda özünə məskən salır və deyir: “Mən heç kimə ağız açmayacağam, Allah mənim ruzimi yetirməyincə kimsənin qapısını döyməyəcəyəm!” Bu minvalla yeddi gün gəlib keçir, amma zahidə yemək-içmək gəlib çıxmır. Ölümcül hala düşmüş zahid inildəyib ərz edir: “Pərvərdigara! Ya mənim ruzimi yetir, ya da tez canımı al ki, bundan artıq əziyyətə düşməyim!” Allahdan xitab olur: “İzzət və cəlalıma and olsun, camaata qaynayıb-qarışmayana qədər sənə ruzi verən deyiləm.” Zahid dağdan enib şəhərə daxil olur. Camaatın arasına daxil olanda, onun zəifləmiş vücudunu görənlər ona su, yemək verirlər. Bu zaman Allah-təala zahidə xitab edir: “Ey Zahid, sən öz əməlinlə Mənim hikmətimi batil etmək istəyirdin. Məgər bilmirsən ki, bəndəmin ruzisini ona bəndələrimin əli ilə yetirmək Mənim üçün səbəblərsiz

(silsilə səbəblər bağlantısı olmadan) yetirməkdən daha əzizdir!"(۱)

Ruzi təkcə maddiyyata aid olmur. Mə`nəvi qazanclar, o cümlədən elm də ruzidir. Bu baxımdan ola bilsin kimsə tənbəllik üzündən elm öyrənməyin arxasınca getməsin. Bə`zən də deyirlər, mən Allaha təvəkkül edəcəm, O Özü elmi mənə mərhəmət edəcək. Bu fikirlərinə qüvvət olaraq mə`sumlardan deyilmiş bu rəvayəti də bəhanə gətirirlər: "Elm, oxuyub-öyrənməklə hasil olmur. Elm elə bir nurdur ki, Allah onu istədiyi (kimsənin qəlbinə yerləşdirir."(۲)

Bəli, elm Allahdan gəlir və Onu istədiyi kəsə verir, amma bizim öhdəmizə düşən vəzifə dərs oxumağımızdır. Bacardığımız qədər çalışmaq, ciddi şəkildə işdən yapışmaq bizim borcumuzdur. Biz bütün mümkün fürsətlərdən istifadə etməliyik. Kimsə yanlış anlamamalıdır ki, zəhmətsiz, tər tökmədən alim ola bilər. Zəhmətə qatlaşmadan .dünya ne`mətlərinə çatmaq olmaz

İnsanın əldə etmək istədiyi bütün ne`mətlər Allahın ixtiyarındadır. Səbəblər toplusunün özü əsas təyinedici amil deyil, onlar ne`mətlərin əldə edilməsi üçün Allahın qərar verdiyi vasitələrdir. Çünki Allah həmin vasitələr və vəsaitlər yolu ilə ruzimizin əldə edilməsini istəyir. Əlbəttə, ola bilsin bir iş görmədən və ya vasitə və vəsait olmadığı üçün Allah Öz lütfü ilə bizə təsəvvür etmədiyimiz ne`mətləri versin. Bunun ,əksinə olaraq



---

.Molla Mehdi Nəraqi. "Camiüs-sadat", c. ۳, s. ۲۲۸-۲۲۹ [۷۵] -۱

.Bihar", c. ۱, s. ۲۲۵" [۷۶] -۲

mümkündür uzun zəhmətdən sonra kifayət qədər səbəblərə əl atdığımıza baxmayaraq sonda öz istəyimizə çatmayaq. Bu onu göstərir ki, səbəblər var deyə arxayın olmaq olmaz. İnsan ancaq Allaha e`timad etməlidir. Yə`ni Allaha ümid .bağlayaraq səbəblərdən yapışmalıdır

Allaha təvəkkül etməyən insanın qəlbi daim iztirab içində olar. Onun nə rahatlığı olar, nə də xoş güzəranı. Çünki, ona arxa olacaq həqiqi dostdan qafil olub yalançı və süst .arxalara e`timad edir. Buna görə də güclü olmağınız üçün Allaha təvəkkül etməliyik

### TƏQVANIN TƏVƏKKÜLLƏ ƏLAQƏSİ

Kim Allahdan qorxsa (təqvalı olsa) Allah ona (hər çətinlikdən) bir çıxış yolu əta edər...“ və ona gözləmədiyi yerdən ruzi verər. Kim Allaha təvəkkül etsə [Allah] ona kifayət (edər. Allah Öz əmrini yerinə yetirəndir. Allah hər şey üçün bir ölçü tə`yin etmişdir.”(١

Şərif ayədə təqva və təvəkkül—hər ikisi zikr olunmuşdur. Bunun özü təqva və təvəkkül arasında dərin bağlılığın olduğunu göstərir və aydın olur ki, bu ikisini bir-birindən ayırmaq mümkün deyil. Təqvanın öndə zikr edilməsi bəlkə də ona görədir ki, təqvanın əldə edilməsi təvəkkülə çatmağın müqəddiməsidir. İnsan təqvalı olmayınca həqiqi .təvəkkülün nə olduğunu dərk etmir



---

.Talaq”, ٢-٣“ [٧٧] -١

Şəksiz Yerin, Göyün bütün işləri Allahın əlindədir. Allahın gücü qarşısında heç bir başqa qüdrət yoxdur. Yaradılış dünyasını öz iradəsi ilə idarə edən Odur. Belə olan surətdə biz ancaq Ona e`timad etməliyik, kömək diləyən əlimizi Ona sarı uzatmalıyıq. Başqalarına hörmət göstərməyi, onların yaxşılıqları müqabilində təşəkkür etməyi Allah bizə tapşırdığı üçün, ilahi vəzifəyə əsaslanaraq onlara öz minnətdarlığımızı bildirməliyik. Bununla yanaşı yersiz tə`riflərdən, qarşı tərəfdən bir şey umduğumuz üçün onun .şə`ninə yalançı tə`riflər söyləməkdən çəkinməliyik

Allaha təvəkkül və e`timad edən kəs ruzini Allahdan gözləyir. Bunun üçün də başqalarına yaltaqlanmağa ehtiyac duymur, ona kömək edəcəklər deyə, yersiz olaraq onların qarşısında kiçilmir. Onun-bunun qarşısında yaltaqlanmaq, əyilmək insanın .izzət-nəfsi ilə bir araya sığmır

Bəli, Allah-təala, övliyalar, ata, ana, müəllim kimi boynumuzda böyük haqları olan kəslərin qarşısında təvazökar olmağı buyurmuşlar. Həmçinin nəsəbləri Peyğəmbərə (s) çatdığı üçün seyyidlərin, peyğəmbər zürriyyələrinin önündə Allaha itaət, Peyğəmbərə (s) hörmət məqsədilə təvazökar davranmağı tövsiyə etmişlər. Allah-təala ata-anaya yaxşılıq etməyi, onlara ehtiram qoymağı Özünə ibadət və bəndəlik mərtəbəsindən sonra zikr edir: “Rəbibn yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılıq etməyi [onlara yaxşı baxıb gözəl davranmağı) buyurmuşdur. Əgər onların biri

və ya hər ikisi sənin yanında [yaşayıb] qocalığın ən düşkün çağına yetərsə, onlara: “Uf” belə demə, üstlərinə qışqırıb acı söz söyləmə. Onlarla xoş danış! Onların hər ikisinə acıyaraq mərhəmət qanadının altına alıb: “Ey Rəbbim! Onlar məni körpəliyimdən (tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et”– de.”(١)

İmam Səccad müəllimin haqqı barədə buyurur: “Sənə elm öyrədən kəsin [sənin boynunda olan] haqqı odur ki, onun qarşısında tə`zim edəsən; (təvazökar davranasan). Onun olduğu məclisi böyük tutub sözlərinə gözəl şəkildə qulaq asasan, yanında hündürdən danışmayasan, üzünü ona sarı tutasan. Əgər kimsə ondan sual soruşsa, cavab verməkdə onu qabaqlama. Onun oturduğu məclisdə başqası ilə söhbət (etmə, başqasının qeybətini danışma.”(٢)

Dünya tamahı ilə başqasının qarşısında təvazökarlıq edən kəs, əslində yaltaqlıq etmişdir. Onun işinin batini şirkdir və həqiqətdə Allahı gücsüz bildiyi üçün başqasına üz tutmuşdur. Allahı tanıyan, Ona olan mə`rifəti kamala yetmiş və təvəkkül məqamını kəsb etmiş şəxs heç vaxt başqasına ümid bağlamaz. Allahın buyurduğu bu ayəyə: “Məgər Allah Öz bəndəsinə kifayət deyilmi?!”(٣) –cani-dildən iman gətirən şəxs heç .vaxt başqasına əl açmaz



---

.İsra”, ٢٣, ٢۴“ [٧٨] -١
.Bihar”, c. ٢, s. ۴٢“ [٧٩] -٢
.Zumər”, ٣۶“ [٨٠] -٣

Qur`an ayələri və hədislər və`d edərək deyir ki, əgər təqvalı olsanız Allah sizin dünyəvi istəklərinizi verəcəkdir. Bununla əlaqədar Peyğəmbər (s) buyurur: “Ey Əbuzər! Allah təbarək və təala buyurur: “İzzət və cəlalıma and olsun, [əgər] bəndəm Mənim istəyimi öz istəyindən irəli salarsa (üstün tutarsa) onu [bu dünyada] elə qəni edərəm ki, ”.fikri-zikri ancaq axirət olar

Allah bu məsələnin ciddiliyini çatdırmaq üçün tə`kid olaraq and içir, çünki deyilən sözlərin qəbulu ümumi camaat üçün o qədər də asan deyil. Bu səbəbdən də and içir ki, xalq inansın. Buyurur ki, əgər bir vaxt bəndəmin istəyi ilə Mənim istəyim bir məsələdə toqquşarsa, bəndəm öz istəyindən vaz keçib Mənim istəyimi irəli salarsa, onun üçün bir neçə şey zəmanət verirəm: Birinci, qəlbində başqalarına nisbətdə ehtiyacsızlıq hissi yerləşdirərəm. Əlbəttə, insanın daim Allaha ehtiyacı var və Ona möhtaclıq hissi də onda var və olmalıdır da. İnsanın ən üstün şərəfi və iftixarı da Allah qapısında fəqir .olduğunu dərk etməkdir

İnsan adətən öz istəklərini başqalarının vasitəsilə həyata keçirdiyi üçün özünü başqalarına möhtac görür. Başqalarına möhtac olmaq hissi insanı xar edir. İnsan nə qədər özünü başqalarına möhtac bilsə, bir o qədər onun qarşısında əyilir, hərdən yaltaqlıq etməli olur, hərdən də xahiş və yalvarışa əl atır. Əgər insan Allahla əlaqəsini möhkəmləndirsə, Onun istəklərini öz istəklərindən önə

çəksə, Allah möhtacsızlıq ruhiyyəsini onun vücudunda yerləşdirib, insanı öz hədəflərinə çatmaqda lazım olan vəsaitlərlə tə`min edəcək. Əlbəttə həmin vasaitlər məqsədə çatmaq yolundakı vasitələr həddindədir. İnsan o vasitələrdən istifadə edib onlardan bəhrələndiyinə görə Allaha şükür etməyə borcludur. Əgər onun dünyəvi məqsədlərinə çatmasında digər insanlar da vasitə olmuşlarsa, onlara da təşəkkür edilməlidir. Bu cür insan vəsaitlərdən bəhrələnməyinə baxmayaraq, özünü ancaq .Allaha möhtac görür, Ondan qeyrisinə ehtiyac hiss etmir

Başqasına möhtac olmamaq hissi böyük ne`mət olub insana şəxsiyyət verir. Əlbəttə, deyilənlərdən elə nəticə çıxmasın ki, insan başqalarının qarşısında təvazökar olmamalıdır. İnsan həm Allahın qarşısında, həm də Onun xəlqi qarşısında təvazökar olmalıdır. İslam maarifi ilə tanışlığı olmayanlar elə bilirlər ki, İslam dini bizim hətta Allah qarşısında da əyilməməyimizi istəyir! Bunların İslam haqqında düşündükləri batildir. Əsil İslam bəndəlikdir. İnsanın ən böyük iftixarı Allah qarşısında özünü kiçik hiss etməsi, alnını torpağa qoymasıdır. İnsan kamalının son həddi budur ki, özünü Haqq-təala qarşısında aciz görsün. Çünki Allah insanın kamalını, tərəqqisini istəyir; istəyir ki, bəndəsi özünün Onun qarşısında aciz görsün, öz ehtiyaclarını Onun dərgahına aparsın. Çünki insanın təkamülü Allaha bəndəlik etməklə mümkün olur; başqalarının qarşısında zillət və kiçiklik hiss etməsin, özünü onlardan asılı, onlara möhtac

bilməsin. Çünki özünü onlara möhtac görsə, istər-istəməz möhtac olduğu qədəri də .zillət və xarlıq hiss edəcəkdir

İnsan öz işinin başqalarının əli ilə düzələcəyini hansı miqdarda hiss edirsə, o qədər də özünü onun qarşısında kiçik görür. Əgər dilinə gətirməsə də, ürəyində özünü xar və zəlil görür. Amma mö`minlər imanın bərəkəti ilə öz işlərini Allahın öhdəsinə buraxsalar, özlərini ancaq Ona möhtac görsələr, artıq başqalarından asılı .olmayacaqlar

Bəli, mümkündür ki, Allah-təala onun ehtiyacını bəndələrindən birinin əli ilə həll etsin və ondan həmin şəxsə təşəkkür etməsini istəsin, amma bununla belə o özünü ancaq .Allaha möhtac bilir

Həzrət İbrahimin (ə) əhvalatında deyilir ki, Nəmrudun əmri ilə həzrət İbrahimi oda atmaq istəyəndə, elə böyük atəş qalanır ki, heç kimin ona yaxın düşməyə cür`əti çatmır, hətta uzaqdan dayanıb baxanda da atəşin istisi baxanları yandırırdı. Vəziyyəti belə görüb qərara gəlirlər ki, Həzrət İbrahimi (ə) mancanaqla atəşin içinə atsınlar. İbrahimi odun içinə atanda Cəbrayıl (ə) kömək üçün onun yanına gəlib deyir: "Köməyə (ehtiyacın var? İbrahim (ə) deyir: "Var, amma sənin köməyinə yox."(١

İbrahim (ə) deyir: Köməyə ehtiyacım var, amma Allahdan qeyrisinin köməyinə möhtac olmaq istəmirəm. Allahın mənim qəlbimdən xəbəri var və ehtiyacımı da bilir. Məsləhəti nə olsa onu da edəcək. İbrahim (ə) bu cür çətin imtahanı müvəffəqiyyətlə verəndən ,sonra Allah onu xəlil məqamına çatdırır və Özünə dost seçir. Əlbəttə



---

.Bihar", c. ١٢, səh. ٣۵" [٨١] -١

başqasına ehtiyac duymamaq kimi bir məqamı əldə etmək elə də asan iş deyil. Bu ancaq Allahın lütf və inayəti ilə olur. Amma Allah-təala o məqama çatmağın müqəddəmatını insanın ixtiyarında qoymuşdur. Həmin müqəddəmatın bir hissəsi də deyildiyi kimi, insanın Alahın istəyini öz istəyindən qabağa salmasıdır. İnsan bunu bacara bilsə, ilk növbədə özünü başqasından asılı hiss etməyəcək. Yə`ni özündə bir .növ, ehtiyacsızlıq duyacaq

İkincisi, dünya işlərinə görə artıq nigaran olmayacaq, dünyasının xeyrini, məsləhətini Allahın öhdəsinə qoyacaq. Ancaq axirətinin nigarançılığını çəkəcək, fikri-zikri axirəti olacaq. Fikrində bu olacaq ki, görək axirəti necə olacaq, bu dünyada axirətlə bağlı vəzifələrinə əməl edirmi? Beləliklə, onun nigarançılığı həmişə axirət olacaqdır. Allah-:təala buyurur

Göyü və yeri onun ruzisinə zamin edərəm. Onun işini, sənətini Özüm qoruyaram.“ ”.Onun üçün hər bir tacirdən daha yaxşı tacirlik edərəm

Kim Mənim istəyimi öz istəyindən üstün tutsa, Mən də Öz növbəmdə onun istəklərini“ həyata keçirərəm. Yeri, göyü onun ruzisinə zamin tutaram. Onlara əmr edərəm ki, onun ruzisini tə`min etsinlər və işini, qazancını ehtimal olunan bəlalardan qoruyub ”.saxlayaram

Hər kəs həyatda yaşaya bilməsi üçün müəyyən bir qazanc yolu seçir, özünə bir iş, sənət tapır ki, onun vasitəsilə ruzi əldə etsin. Təbiidir ki, ticarət, əkinçilik və s. işlərin səmər verməsi, davamiyyəti üçün heç bir zamin

yoxdur: Haradan mə`lumdur ki, bağ meyvə verəcək və ya bostan məhsul gətirəcək və ya inək, davar sağ qalacaq? Kim bilir ki, insanın alış-verişində, ticarətində xəsarəti ?olmayacaq

Allahın istəyini öz istəyindən irəli salan adama Allah zəmanət verir ki, onun işini, bağını, .heyvanını, bostanını ehtimal olunan qada-bəlalardan sığortalayacaq

Hər hansı müamilədə, ticarətdə ona kömək edər ki, ziyana düşməsin." Daim dünya" fikrində olan adamlar sə`y edirlər elə adamla alış-veriş etsinlər ki, daha çox xeyir qazansınlar. Elə bir ticarəti, müamiləni seçirlər ki, daha çox qazanc gətirsin. Həmişə narahat olurlar ki, birdən olmaya zərərə düşələr və ya az qazanc götürələr. Allah-təala buyurur. Mənim istəyimi öz istəyindən önə çəkən adama hər bir alış-verişində arxa duraram ki, daha çox qazanc əldə etsin; Hər bir işdə Mənim əlim onun üstündə olar: Elə edərəm ki, özü düşünüb, tədbir töküb, plan cızana kimi, kiminlə və necə alver edəcəyini götür-qoy edənə kimi, Mən onun işini yoluna qoyaram. Onu himayə edib, .mənafeyini qoruyaram

Peyğəmbər (s) insanın öz ruzisi üçün nigaran olmamasına işarə edərək buyurur: "Ey Əbuzər! Əgər Adəm övladı ölümdən qaçdığı kimi öz ruzisindən qaçası olsa, onun [tə`yin edilmiş] ruzisi, o harada olsa da gəlib ona çatacaqdır, necə ki, ölüm insanı ".haqlayır

İnsanın ölümdən xoşu gəlmir, həmişə ondan qaçır, amma axırı ölüm onu haqlayıb öz kamına çəkir. Eləcə də insan öz ruzisindən qaçmaq istəsə, qaça bilməz, yenə də

axırda gəlib ona çatacaq. Təyin edilmiş qədərdən qaçmaq olmaz. Əgər bir adam çox çalışsa, işləsə də, məlum deyil ruzisi çatacaq, ya yox. Çox görünüb ki, bəzi adamlar ruzi üçün canlarını oda-suya vurublar, amma axırda acından ölüblər. Bununla əlaqədar, həddən artıq varlı adamlar haqqında qəribə hekayələr nəql etmişlər ki, öz həyatlarında elə vəziyyətlə üzləşmişlər ki, məcbur olmuşlar acından ölməmək üçün öz ayaqqabılarını yesinlər! Başqa bir tərəfdən də elə əlsiz-ayaqsız adamlar olub ki, əllərindən bir iş gəlməməsinə baxmayaraq, Allah-təala onlara saysız-hesabsız sərvət .əta edibdir və qismətlərində olan dövlətə çatmışlar

Bununla belə insan öz işindən qalmamalıdır. Daim çalışmalı, öhdəsinə düşən vəzifəsini yerinə yetirməlidir. Qəzavü-qədərə e`tiqad bəhanəsi ilə tənbəllik etməməlidir. Çünki Allahın tənbəl adamlardan acığı gəlir. Amma, əgər insan təhsil və başqa bir sənəti seçmək məsələsində azad olub onlardan birini seçmək vəzifəsini daşısa, ruzinin kasad olacağından qorxub elmi rədd etməməlidir. Əgər Allaha mə`rifəti, imanı olsa, ruzinin Allah tərəfindən yetişməsinə olan imanı onu vadar edəcək ki, xatircəmliklə elmin ardınca getsin və ruzi cəhətdən arxayın olsun. Çünki, imanlı şəxs müqəddər olmuş .ruzidən məhrum olmayacağını bilir

Bu maraqlı və ibrətamiz hekayəni Ayətullah Mirzə Hadi Xorasani öz əsrinin tanınmış alimlərindən olan molla Nəzərəli Taliqaninin həyatı haqqında yazdığı əsərində nəql .edir

:Bu cür müstəsna və nadir hadisələr əsasən üç mühüm amilin bəhrəsidir

;Çarəsizliyin, sıxıntının son həddinə çatmaq və həqiqi mə`nada bu halı keçirmək .١

;İxlas .٢

;Təvəkkül .٣

Əgər ehtiyacı olan insan pərişan halda, riyasız və son dərəcə ixlasla öz maddi və mə`nəvi problemlərinin həlli üçün hər dərdə çarə qılan Allaha təvəkkül etsə, ümidini hər kəsdən üzüb ancaq Allah dərgahına üz tutsa, yəqin ki, onun şər`i hacətləri yerinə .yetər

Şəksiz, bu şərtlərlə Allah dərgahına üz tutanın işindəki düyünü Allah Özü açacaq. Artıq .“telefon”, “məktub” kimi qəribə hallara da ehtiyac olmayacaq

Hərdən hədsiz sıxıntıda olan insan hər vasitə ilə bu yükün altından çıxmağa çalışır. Suda batan insan canını qurtarmaq üçün əli çatan hər bir şeydən yapışıb sağ qalmağa necə can atırsa, sıxıntıda olan bu iki–müxlis, mütəvəkkil-alim də böhranlı şəraitdə .naçar qalıb “telefon” və “məktub” kimi ağlagəlməz vasitələrə əl atmışlar

Aləm səbəblər aləmidir: Allah, Rəbbül-ərbab və səbəblər səbəbidir. Həqiqətdə onların ixlası və təvəkkülü Sübhan Allahın lütfünə yetmiş, onları həzrət Haqqın inayətinə .qovuşdurmuşdur

Bu arada telefonun, məktubun tə`sirə səbəb olacaq heç bir rolu yoxdur. Əgər onlar bu iki əlaqə vasitəsindən istifadə etməsəydilər, Xudavəndi Kərim yenə də Öz kərəm əlini onlara uzadacaq, inayətini onlardan əsirgəməyəcəkdir. Çünki, həmin çətin şəraitdə Allahın lütfündən bəhrələnmək ləyaqətini qazanmışdılar. Ləyaqətli insanın kömək .edilməyə haqqı var

Nəzərəli Taliqani tələbəlik illərində əksər ruhani tələbələri kimi qənaətlə, şərafətlə yaşasa da, həyatına ayaq açmış yoxsulluğun məişətini bərbad etdiyini görürdü. Bunun üçün də olduqca sıxıntı içində idi, öz aqibətini düşünəndə sarsılırdı. Çünki, demişlər: "Qazancı, dolanışığı olmayanın axirəti də olmaz." Və ya "fəqirliyin axırı küfrdür." :Nəzərəli Taliqani özündən soruşurdu

"!?Bu vəziyyətlə mən necə ailə qurum"

Axırı bir gün, həyatına vurulmuş kor düyünü açmaq üçün yollar axtarmağa başlayır. Fikirləşir: "Nə edim, hara gedim, dərdimi kimə söyləyim? Məni məqsədimə çatdıracaq "?qısa yol hansıdır

:Ağlından bir-iki fikir keçir

.Zəmanənin mərcei-təqlidinə–Molla Əli Kəniyə məktub yazım, ondan kömək istəyim .١

.Padşaha–Nasirəddin şaha məktub yazım, vəziyyətimi ona bildirim .٢

.Əmirəlmö`minin Əliyə (ə) təvəssül edim, hacətimi ondan istəyim .٣

Çox fikir-xəyaldan sonra nəhayət səhərə yaxın bu qərara gəlir ki: birincisi, camaata – ona-buna ağız açmaq, necə deyərlər, insanın öz abır-heysiyyəti ilə oynaması .bəyənilən iş deyil

:Saib Təbrizi demişkən

Tamah əlini başqasına açma sən

!Öz abrınla körpü salıb keçmə sən

İkincisi həzrət Əli (ə) kimi son dərəcə təqvalı, dünyaya üç dəfə "talaq" vermiş bir kəsdən dünya malı istəmək ağlabatan deyil. Beytul-mala həddən artıq diqqət yetirən həzrət Əli (ə), ədaləti me`yar tutub öz doğma qardaşı Əqilə heç bir dirhəm də ?vermədi, indi mən bu qədər dünya malını ondan necə istəyim

Axır çıxış yolunu Allahın özünə məktub yazmaqda görür, çox fikirləşməyib, qələmi götürüb Allaha məktub yazır. Xalisanə, tam səmimiyyətlə dərdini Allahla bölüşür və :istəklərini aşağıdakı şəkildə izhar edir

Bismillahir-rəhmanir-rəhim"

Müqəddəs dərgahına alqışlar deyib Peyğəmbərə (s), onun pak ailəsinə çoxlu salamlar göndərəndən sonra, ehtiramla ərz edib bildirirəm ki, mən üstümdə olan

.borcların, hədsiz yoxsulluğun ucbatından çıxılmaz vəziyyətə düşmüşəm

:İstəklərimi aşağıdakı tərtiblə qeyd edirəm

.Bütün şəraiti, əşyaları da olmaqla şəxsi bir mənzil .۱

.Ailə qurmağa ağıllı, kamallı, cavan və gözəl bir xanım .۲

.Bir nökər, bir xidmətçi, e`tibar ediləcək və bacarıqlı bir aşpaz .۳

.Faytonçusu da olmaqla bir ədəd yaxşı fayton .۴

.Aylıq qazancım üçün bir kənd .۵

.Yayda dincəlmək üçün paytaxtın şimalında bir bağ .۶

.Borclarıma yetəcək, həm də dünya və axirət abrımı qoruyacaq həddə nəqd pul .۷

Ünvan: Xan Mərvi mədrəsəsi, birinci salon, ikinci mərtəbə, ikinci hücrə, Nəzərəli .Taliqani

Nəzərəli sübhün şəfəqləri görünməmiş hücrəsindən çıxıb məktubu aparıb mədrəsənin .yaxınlığındakı "Şah məscidi" nin darvazasının dəstəyinə keçirib geri qayıdır

Namazını qılıb, başını atıb yatır. Təsadüfən, həmin günün səhəri Nassirəddin şah sarayın ə`yan-əşrəfi ilə bir yerdə Tehrandan səltənət ovlağına sarı istirahətə gedirmiş. Şah və onu müşayiət edən hey`ət Tehranın şərq istiqamətinə dönəndə, birdən güclü tufan qalxır. Toz-torpağı göyə sovuran külək faytonların hərəkətinə mane olur. Şah vəziyyəti belə görüb əmr edir ki, hava sakitləşənə qədər bir müddət həmin yerdə dayanıb hərəkət etməsinlər. Faytonçular atların başını dalda bir

yerə döndərib faytonları külək tutmayan bir yerdə saxlayırlar. Bu əsnada külək Nəzərəlinin məktubunu darvazanın dəstəyindən qoparıb havada oynada-oynada, yerdə qova-qova düz gətirib Nasirəddin şahın sinəsinə yapışdırır. Şah qəflətən sinəsinə çırpılan məktubdan diksinir. Toz dolmuş gözlərini ovuşdura-ovuşdura .məktubu qaldırıb üzünə baxır. Zərfin üstündəki ünvan şahın diqqətini özünə cəlb edir

Şah zərfi açıb məktubu oxumağa başlayır və mətləbdən hali olandan sonra bu .hadisəni yaxşı fala yozub tez geri–Tehrana qayıtmaq əmrini verir

Saraya çatar-çatmaz dövlət adamlarını tə`cili keçiriləcək müşavirə toplantısına .çağırır. Sonra yaxın adamlarından birini namədə göstəri-lən ünvana yollayır

İki saatdan sonra şahın iştirakı ilə dövlət adamlarından ibarət iclas təşkil edilir. Şah öz sözünə belə başlayır: Allaha şükürlər olsun ki, ovlağa çatmamış öz ovumu kəməndə !saldım və həmişəkindən daha gözəl bir şəkildə məqsədə çatdım

Yoldakı macəranı saray əhlinə nəql edəndən sonra deyir: Bilmirəm hansı dillə Allaha şükür edim ki, Öz zəif bəndəsi Nasiri belə bir vəzifəni yerinə yetirməyə layiq bilib və Öz .bəndələrindən birinin ehtiyaclarını ödəməyi mənə həvalə edib

Bu vaxt şahın göndərdiyi adam Molla Nəzərəli ilə saraya daxil olur. Şah üzünü ona ?tutub soruşur: Adın nədir

.Nəzərəli–

?Haralısan–

.Taliqanlı–

?Bu yaxınlarda bir kəsə məktub yazmısanmı–

Nəzərəli bir anlığa duruxub cavab verir: Bəli! Bu gün səhər Allaha bir məktub .yazmışam

?Məktubu yazıb nə etdin–

.Aparıb "Şah məscidi"nin darvazasına sancdım–

?Allahdan nə istəmişdin–

.İstəklərim yeddi bənddən ibarət idi–

Şah məktubu Molla Nəzərəliyə göstərib soruşur: Bax, gör sənin məktubundur, sənin ?xəttindir

.Bəli, bu gün, səhər mənim yazdığım məktubdur–

Nəsirəddin şah gözlədiyi adamın Nəzərəli olduğuna xatircəm olandan sonra üzünü məclisdəki saray adamlarına tutub deyir: Şükür Allaha ki, axtardığım adamı tapmışam. Bu, Allahın mənə nəsib etdiyi böyük bir ne`mətdir. Amma istəmirəm ki, siz bu ne`mətdən ibnəsib qalasınız. Sizi də bu ne`mətə şərik etmək istəyirəm. Mən sıra ilə bir-bir Nəzərəlinin istəklərini məktubdan oxuyacağam, sizlərdən kimsə onun .istəklərindən birini öz boynuna götürmək istəsə, mənə desin

.Birinci istək: Bütün şəraiti ilə birgə, əşyaları da içində olmaqla şəxsi bir mənzil

.Şah deyir: Onun birinci istəyini mən özüm verirəm

Həmin anda əmr edir səltənətə mənsub evlərdən biri içindəki əşyaları ilə bir yerdə .onun adına keçirilsin

.İkinci istək: Ağıllı, kamallı, cavan və gözəl bir xanım

Vəzirlərdən biri icazə alıb ayağa qalxdı və dedi: Nəzərəli deyən sifətdə mənim bir qızım .var. Öz meylimlə qızımı ona verməyə hazıram

.Üçüncü istək: Bir nökər, bir xidmətçi, e`tibarlı və bacarıqlı bir aşpaz

.Başqa bir vəzir tez ayağa qalxıb deyir: Bunlar mənim öhdəmə

.Dördüncü istək: Faytonçusu ilə birgə yaxşı bir fayton

.Saray adamlarından biri bu istəyi öz boynuna götürür

.Beşinci istək: Aylıq maaşı çıxaracaq bir kənd

.Baş vəzir yaxın nahiyədəki kəndlərdən birini Nəzərəlinin ixtiyarına keçirir

.Altıncı istək: Paytaxtın şimalında səfalı bir bağ

Məclisdəki saray adamlarından biri bu istəyi öz boynuna götürür və özünə məxsus bağ .evlərindən birini Nəzərəliyə hədiyyə edir

.Nəzərəlinin Allahdan yeddinci istəyi kifayət qədər pul idi

Birinci istəyi şəxsən öz öhdəsinə götürmüş Nasirəddin şah Nəzərəlinin axırıncı istəyini .də özü həyata keçirir

Həmin günün səhərisi Molla Nəzərəli Nasirəddin şahın ona bağışladığı evə köçür və bir .məclis təşkil etməklə cavan xanımını–vəzirin qızını evinə gətirir

Nəzərəli ömrünün axırına qədər Allahın ona kərəm qıldığı bu ne`mətlərin müqabilində (şükür səcdəsi edərdi və Allahın şükründən qafil olmazdı.(١)

Ələ düşmüş fürsətlərdən lazımınca istifadə edilməlidir. Həzrət Əli (ə) buyurur: “Keçmiş artıq keçmişdir, gələcək də hələ gəlməmişdir, elə isə qalx, iki yoxluq arasında (keçmiş .və gələcək arasında) olan vaxtı (indiki zamanı) qənimət bil

İnsanın əli nə keçmişə, nə də gələcəyə çatır. Bunun üçün də insan hal-hazırda ixtiyarında olan vaxtdan səmərəli istifadə etməlidir. Çox adamlar öz həyatlarını gələcəyə və ya keçmişə görə, həzrət Əlinin (ə) sözləri ilə desək iki yoxluğa görə məhv edirlər. Halbuki, insan hazırkı zamanda düzgün yolu seçməklə həm keçmişdəki .səhvlərini düzəldər, həm də gələcəyini abad edə bilər

İlk baxışda insanların zahirinə baxıb tez qiymət verməməli, onlar haqqında qəti hökm .çıxarmamalıyıq. İmkan verməliyik qarşı tərəf öz batinini aşkar etsin

Adətən insanlar evlilik həyatının ilk illərində çətinliklərlə üzləşməli olurlar. Bunu təbii sayıb çətinliklərlə qarşılaşmaqdan qorxmaq lazım deyil. Əksər insanların cavanlıqda səbri, dözümü az olur. Orta yaşlardan başlayaraq, artıq kifayət qədər həyat təcrübəsi .qazanan insan çətinliklərdə bişərək həyatda daha dəqiq addımlar atır və az səhv edir



---

.Həmin, səh. ٢٧٧ [٨٢] -١

Sıxıntılı anlarda ümidsizliyə qapılmamalıyıq, həyatı öz gözümüzdə və başqalarının .gözündə zülmətə döndərməməliyik

.Allaha üz tutmaq insana qüvvət verir və ona çətin yolları keçməkdə yardımçı olur

Çətin anlarda insan bə`zən gözləmədiyi hadisələrlə üzləşir və çox vaxt bu hadisələrə diqqət yetirmir. Halbuki, həmin kiçik və ani hadisələr ona böyük hadisələrdən xəbər verirlər. İnsanın qeyri-adi hesab etdiyi bir hadisə hansısa mühüm bir xəbərin müjdəçisi :ola bilər. Hafiz Şirazinin dili ilə desək

Qeyri-adi işlərdən kam tələb eylə ki, mən

.O zülfü pərişandan mə`rifət kəsb etdim

İnsan təbii olaraq öz qərarına əsaslanır. Halbuki, adətən bizim düz bildiyimiz qərar xəta ilə yanaşı olur. Çünki, düşdüyümüz hadisədə Allahın hikmətini görmürük, ancaq hadisələrin zahirinə baxıb qərar çıxardırıq. Bunun üçün də çıxardığımız qərarlar çox .vaxt səthi olur

:Allah-təalanın buyurduğu bu ayəyə diqqət edin

Bə`zən xoşlamadığınız bir şey sizin üçün xeyirli, bə`zən də xoşladığınız bir şey sizin...“ (üçün zərərli ola bilər. [Onu] Allah bilir, siz bilməzsiniz.”(۱

səh:۱۵۹

---

.Bəqərə”, ۲۱۶“ [۸۳] -۱

İnsan öz asudə həyatı, varı, dövləti ilə başqasının yanında qürrələnib ona yuxarıdan aşağı baxmamalıdır. Bu hərəkətin özü naşükürlükdür və ne`mətin əldən çıxmasına .səbəb olur

:Baxmayaraq ki, bə`zi şairlər yaxşını, pisi zəmanədən bilmişlər və demişlər

!Çərxi-fələk gör necə dövran edir

!Bu gün taxta çıxardır, sabahısı viran edir

,Birisinə izzət verir, digərini xar qılır

.Gah məhəbbət göstərir, gah da qəmə batırır

Amma Allaha e`tiqadı olan insan "çərxi fələyin", "ruzigarın" onun həyatında dönüş yaradacağına, mühüm rol ifa edəcəyinə inanmır. Həqiqi Allah bəndəsi izzəti də, zilləti də Allahdan bilir, həyatında öz əməllərinin yaxşı və ya pis əks-əməlini görür. Daha .ruzigarı bu işdə təqsirli bilmir

!Gileylənib demə, niyə bəxt ulduzum parlamır

.Yazıq ulduz!", əməl daşın kütləşib cilalamır"

## TELEFON MACƏRASI

Tanınmış alim və şair Məhəmmədəli Mücahidi dövlət nəşriyyatında nəzarət şöbəsinin rəisi vəzifəsində işlədiyi vaxt başına gəlmiş qəribə əhvalatlardan birini aşağıdakı :şəkildə nəql edir

Öz iş otağımda oturub işimlə məşğul idim. Bu vaxt qapı döyüldü və ardınca xoş simalı bir ruhani içəri daxil

səh:۱۶۰

oldu. Geyimi olduqca səliqəli və zövqə uyğun idi. Alnındakı qırışlar onun dünya görmüş, ruzigarın isti-soyuğunu dadmış bir insan olduğunu bəlli edirdi. Zamanın cövrü-cəfası üzündə dərin qırışlar açsa da yaşı əllini göstərirdi. O, öz mətin rəftarı ilə müsahibini .hörmətli davranmağa vadar edirdi

Salam verib hal-əhval tutduqdan sonra dedi: Belə eşitmişəm ki, ruhani ailəsində böyümüsən və özün də soylu, köklü bir nəsildənsən. Vaxtınızı çox almayacağam; bir kitab yazmışam, onu çap etmək üçün sizin köməyinizə ehtiyacım var. Hansı çapxanaya getdimsə, məndən çapa icazə kağızı istədilər. Əgər bu kitabın çapına icazə .kağızı versəydiniz, ömrüm boyu sizə minnətdar olardım

Baxışımı iş stolumun üstündə qalanmış kitablara yönəldib dedim: Baxın, bütün bu kitablar çap üçün "növbə" gözləyirlər. Hamısı yoxlanıb çapa göndərilməlidir. Hamısının da müəllifi siz edən xahişi edir,–deyirlər: tələsirik, vaxtımız yoxdur, bu kitab çox mühüm kitabdır və sair. Açığını desəm, mənim öz peşəm müəllimlikdir. Pedaqoji sahədə çalışıram. Amma bu ağır yükü də mənim boynuma yıxıblar. Gərək saatlarla oturub kitabları araşdıram! Aydındır ki, bunların hamısı bir günün işi deyil. Necə deyərlər, bir ürək bu qədər dilbərlə nə etsin, hansına könül versin?... Siz mənim yerimə ?olsaydınız, nə edərdiniz

Kişi bir ata mehribanlığı ilə dedi: Övladım! İnanmıram öz zənnimdə yanılmış olam, siz dərd əhlisiniz, mənim də dərdimi gərək ki, yaxşı anlayırsınız. Bu kitab qəribə bir əhvalatdan–mənim Allaha necə telefon açmağımdan bəhs edir. Məncə xalqın, xüsusilə də cavanların bu hekayəni mütaliə etmələri onların xeyrinə olardı. Hər halda, cəmiyyətə bir xeyri olacağını düşünüb bu kitabı yazdım. Bu telefon macərasının bərəkəti ilə təkcə mənim yox, bəlkə də yüzlərlə insanın həyatı dəyişib. Əgər sizin .yerinizə olsaydım, yubanmadan kitabın çap icazəsini verərdim

Onun danışığında hədsiz səmimiyyət duyulurdu. Bu səmimiyyət məni çoxdan .həsrətində olduğum bir aləmə çəkib aparırdı

Kişinin bu sözlərini eşidəndə bir anlığa xəyala daldım. Xəyalım məni çox da uzaq olmayan bir keçmişə götürdü: Ustadım–böyük arif Ağa Müctəhidinin vəfatından düz yeddi il keçirdi. Onun vəfatından sonra bu cür qəribə əhvalatları eşitməyə də tamarzı qalmışdım. Ona görə də fürsəti əldən qaçırmayıb dedim: Kitabı yoxlamağa ehtiyac .yoxdur. Eləcə, mündəricat şəklində kitabın mövzusunu mənə açıqlayın, yetər

Dedi: Kitabın adını ondakı həyati ibrətləri nəzərə alaraq “İbrətəngiz” qoymuşam. Kitab iki bölümdən ibarətdir: Birinci bölüm mənim Allaha necə telefon açmağım haqqındadır. .İkinci bölüm isə bu telefon zənginin saysız hesabsız bərəkətlərindən söz açır

Kişi bunları deyib Allahın ona nəsib etdiyi bu ne`mətinköməyi ilə bu günə qədər nə kimi xeyriyyə işləri gördüyünü ardıcıllıqla saymağa başladı. O cümlədən bunları dedi: Bir neçə uşaq evi, bağça, məktəb və məscidin istifadəyə tam hazır halda tikilib təhvil verilməsi, onlarla sahibsiz uşaqların məktəb təhsilindən institutu qurtarana qədər bütün xərclərinin ödənməsi, bir neçə kəndə içməli su kəmərinin çəkilişi, neçə hektar bağ sahəsinin ümumi xeyriyyə işləri üçün vəqf edilməsi, bir neçə pulsuz fəaliyyət göstərən tibbi xidmət mərkəzlərinin yaradılması, pulsuz fəaliyyət göstərən .əczaxanaların tikilib istifadəyə verilməsi və sair

Kişi dedi: Kitabda bütün bu işlərin hər biri haqqında dəqiq rəqəmlər, tarix və sənədlər .göstərilməklə ətraflı mə`lumat verilmişdir

Allah-təalanın bu xeyirxah ruhaniyə nəsib etdiyi belə böyük tövfiqdən heyrətə gəldim. .Ondan xahiş etdim ki, Allahla olan telefon məsələsini mənim üçün danışsın

:O, gözləri doluxsunmuş halda öz hekayəsini belə başladı

Ali-dini təhsil üçün yaşadığım Ərak şəhərindən Qum elmi hövzəsinə gələndə cavan bir tələbə idim. O vaxtlar Ayətullah Bürucerdinin mərcəiyyət illəri idi. İyirmi beş yaşım ancaq olardı. Bununla belə, tələbə ola-ola beş nəfərlik ailəmin dolanışığını da tə`min .etməli idim

Elmi hövzənin ayda verdiyi təqaüd ev kirayəsini və aylıq xərclərimi ödəmirdi. Başqa heç bir yerdən də kömək

almırdım. Həyat yoldaşım hədsiz kasıblığımıza görə gileylənməsə də əksər vaxtları .evin xərclərini tə`min etmək üçün naçar qalıb borca girməli olurdum

İki-üç il bu minvalla keçdi. İş o yerə çatdı ki, məhəllənin bütün mağazalarına çörəkçidən tutmuş qəssabına qədər borclu qaldım. Artıq gedib onlardan alış-veriş .eləməyə üzüm gəlmirdi

Vəziyyətimin belə çətin anlarında ev sahibi də bir tərəfdən məni sıxışdırıb evin neçə aylıq gecikmiş kirayəsini bu ayın kirayəsi ilə bir yerdə tələb edirdi. Axırıncı dəfə qapıya gəlib dedi: Əgər iki günə kimi borclarını verməsən incimə, evinin əşyalarını boşaldacam .həyətə, evi də kirayə ödəmək gücü olan başqa birisinə verəcəyəm

.Artıq bıçaq sümüyə dirənmişdi

Çox fikirləşəndən sonra son qərarımı çıxardım... Səhər tezdən heç kimə bir söz demədən evdən çıxdım. Özlüyümdə belə qərara gəldim ki, bu iki günü gözə görsənməyim. Başımı lap itirmişdim, nə edəcəyimi bilmirdim; artıq səbrim tükənmişdi... Uşaqlarımın sönük gözlərinə baxa bilmirdim, məhəllədəki dükan sahiblərinin eyhamlı baxışlarına dözə bilmirdim. Hamısından betəri də evimin əşyalarının çölə .boşaldılacağını təsəvvürümə gətirəndə az qalırdı bağrım çatlasın

Qozərxan məhəlləsindən keçəndə bir anlığa gözüm həzrət Mə`sumənin (ə) hərəminin .günbəzinə sataşdı

İxtiyarsız olaraq kövrəldim... qəlbim sındı; gözlərimdən yaş süzülüb yanaqlarıma oturdu. Qəlbimin dərdini sinəmdə sıxılıb qalmış qəhərlə dilimə gətirdim. Mə`sumə xanımla (ə) dilsiz bir dillə dərdləşib hərəmə tərəf üz tutdum. Sübh namazını hərəmdə .qılıb çölə çıxdım

Xiyabanın kənarında dayanmış bir neçə avtobus maşına sərnişin yığırdı. Ürəyim qüssə ilə dolu, ciblərim isə boş idi. Ciblərimin künc bucağını eşələyib axırı qoltuq cibimdən ۵۰ qəpik pul tapdım. Tehrana gedən avtobuslardan birinə əyləşib xəyala dalaraq maşının .yola çıxmasını gözlədim

Yol boyu Allahla olan qəlbi bağlılığım bir an da olsun üzülmürdü. Arada özümdən asılı olmayaraq qəhərlənir, göz yaşı axıdırdım. Bütün vücudum qəribə bir həyəcana .bələnmişdi. Sanki köz üstündə oturmuşdum

:Sürücünün səsinə xəyaldan ayrıldım

!Ağa! Çatmışıq, enə bilərsiniz

Maşından yerə enəndə başımı qaldırıb günə baxdım. Gün bir adam boyu qalxmışdı. Hara getməliyəm?! Bu suala cavabım yox idi. Asta addımlarla üzü İmam Hüseyn .meydanına tərəf yola düşdüm

Yol kənarındakı mağazalar biri digərinin ardınca açılır, camaatın get-gəli hər dəqiqədə artırdı. Camaatın arasında getməyə yeri olmayan avaraya bənzəyirdim. Mənə elə gəlirdi ki, kənardan baxanlar mənə rişxənd edirlər. Buna görə də sə`y edirdim ki, .qırağa-bucağa çox boylanmayım və düz bir istiqamətdə hərəkət edim

Birdən yadıma düşdü ki, qardaşım deyirdi onun İmam Hüseyn meydanına birləşən yuxarı xiyabanda, pasajların düzüldüyü istiqamətdə xalça dükanı var. Dükanın dəqiq ünvanını bilməsəm də, qardaşımın dediyinə görə mağazanın üstündə rəngli, böyük .reklam tablosu olmalı idi

.Dedim gedib qardaşıma bir baş çəkim

Qardaşımın məni görməyə gözü yox idi. Mən dini mədrəsəyə girəndən qardaşım da .daxil olmaqla ailəmizin üzü məndən dönmüşdü

Axtarıb qardaşımın dükanını tapdım. Dükan mən təsəvvür etdiyimdən çox böyük idi. Dörd iri qapısı, hündür divarları olan dükanın vitrini zövqlə bəzədilmişdi. Dükanın qarşısında qapısı açıq mersedes maşın dayanmışdı. Hiss olunurdu ki, qardaşım dükanın qapılarını yeni açmışdı və maşının qapısını bağlamaq ya yaddan çıxmış, ya da .dükandan nəsə götürüb tez geri qayıtmaq istəyirmiş

Dükana girib salam verdim. Qardaşımın gözü mənə sataşcaq tə`nə ilə dedi: Əleykum! Gün hayandan çıxıb ki, biz kasıbları da yad etmisən?! Sən hara, bura hara? Heç bilirsən neçə ildir bir-birimizi görmürük? Axı böyük var, kiçik var; bəs qanacaq, mə`rifət... Hər nə olsa da mən sənin böyük qardaşınam! Amma yox... Səndə taqsır yoxdu, ağıllı adam Qumu qoyub Tehrana gəlməz ki! Hər necə olsa da, sən mollasan; gedənin, gələnin... Biz

.tehranlıları adam saymırsız ki... Haqqın var qardaş. Nolar, bizim də Allahımız var

.Ürəyimdə dedim, İlahi! Bu yenə başladı atmacalı sözləri ilə məni təhqir etməyə

Başımı aşağı salıb dinmədim. Qardaşım stolun siyirməsindən bir-iki bağlama pul götürüb dedi: Əgər bir az gec gəlsəydin, mən artıq getmişdim. Pulları aparıb banka qoymalıyam. İşin yoxdursa burda otur, mən indi gəlirəm. Tərslikdən satıcım da bu gün gəlməyəcək. Çox çəkməz, bir saata tez gedib qayıdacam. Qayıdanda, inşəallah oturub .əməlli-başlı söhbət edərik

O getdi. Dükanda bir mən qaldım, bir də qalaq-qalaq yığılmış ipək xalçalar. Dükana o... qədər xalça yığılmışdı ki, aralarından çətinliklə keçib getmək olurdu. Gəlib görən lazım ...idi bu qədər xalçanı

Bu qədər mal-dövləti görmək olan-qalan hövsələmi də əlimdən aldı. Qəhər ilişib boğazımda qalmışdı, nəfəsim get-gedə təngiyirdi. Öz günümə bir də qardaşımın vecsizliyinə baxanda əsəbiləşirdim. Birdən-birə ixtiyarsız olaraq dizlərim əsdi, ürəyim .elə şiddətlə döyünməyə başladı ki, deyirdin bu dəqiqə sinəmdən qopub yerə düşəcək

Üzümü göyə tutub dedim: Ay Allah! Biz hər ikimiz Sənin bəndələrinik, hər ikimiz də qardaşıq. Qisməti verən Sənsən! Onun hər şəraiti var, malı-pulu başından aşır, amma mən cavanlığımı din yolunda qoymuşam, elə bir anım yoxdur ki, kasıbçılıqla çarpışmayım. Axı, bu qədər

də olmaz. Səni and verirəm izzət və cəlalına, bundan artıq məni onun-bunun yanında xəcalətli eləmə! Mənə elə bir dünya malı nəsib elə ki, onunla Sənin möhtac bəndələrinə əl tutum, mənə verəcəyin ne`məti ehtiyacı olanların yolunda xərcləyim. Bir kişi üçün yoxsulluqdan böyük dərd ola bilməz. Necə ki, buyurmuşlar: "Bir kəsin dolanışığı olmasa ".axirəti də olmaz

Bu əsnada gözüm stolun üstündəki telefona sataşdı. Baxışlarım bir müddət telefona zillənib qaldı, telefon elə bil məni səsləyirdi. Bilmirəm, birdən-birə ağlıma haradan gəldi, amma içərimdə qəribə bir səs mənə deyirdi ki, dəstəyi qaldır, bir-iki kəlmə ilə .Allahla dərdləş

Dəstəyi qaldırdım; gözlərimi yumub ardıcıl bir-neçə nömrə yığdım. Dəstəyi yenicə qulağıma söykəmişdim ki, o tərəfdən bir səs dilləndi: Alo, buyurun! Alo, eşidirəm, niyə ...danışmırsınız? Alo, alo

Tutduğum işdən peşman oldum. Dəstəyi yerinə qoymaq istəyirdim ki, telefondakı naməlum səs yalvarıcı bir tonla dedi: Səni and verirəm inandığına, dəstəyi yerə qoyma. Biz səhərdən sizin zənginizi gözləyirdik, sizin köməyinizə ehtiyacımız var. Lütfən, öz ?adresinizi deyin, bizi bu intizardan qurtarın. Məgər Allahla dərdləşmək istəmirdin

Bir anlığa duruxub dükanın adresini söylədim, amma tutduğum işdən yaman peşman .oldum. Yerimdə qərar tuta bilməyib çölə çıxdım

Dükanın kəndarında oturub qardaşımın gəlməyini gözləyirdim. Öz-özümə dedim: Bu nə iş idi açdın başına, oturduğun yerdə özünü niyə işə saldın? Deyəsən yavaş-yavaş ağlımı itirirəm; indi gəl cavabını ver... Axı hansı ağıllı adam indiyə qədər telefon vasitəsilə Allaha dərdini deyib? Bu nə işdi bu gün mənim başıma gəldi, ruhani olan bir !?şəxs də belə iş görərmi

Özümü bir xeyli məzəmmət edəndən sonra dedim:–Yaxşı, bütün bunlar bir tərəfə,– telefona cavab verən şəxs haradan bildi ki, mən Allahla dərdləşmək istəyirdim? İkincisi, niyə yalvarıb deyirdi dəstəyi yerə qoymayın, mənim köməyimə ehtiyacları var? Mən ki, öz başıma əlac edə bilmirəm, onlara necə kömək edəcəkdim? ?Hamısından da maraqlısı, onlar məni haradan tanıyırdılar

Bu suallar get-gedə zehnimi çulğamağa başladı, amma heç birinə qane edici cavab tapa bilmədim. Bu fikirlərdə dolaşıb nə qədər çək-çevir etdiyimi deyə bilmərəm, onu bilirəm dükanın qarşısında ani tormoz verib dayanan mersedes maşının təkərlərinin .səsinə fikirdən ayıldım

Əynində zabitlərin libasına oxşar xüsusi forma geyinmiş sürücü tez maşından sıçrayıb ehtiyatla arxa qapını açdı və çəkilib əmrə müntəzir halda bir kənarda dayandı. Bir az sonra arxa qapıdan ۶۰-۶۵ yaşlarında bir qoca aşağı endi. Əyninə üçlük takım libas .geyinmiş bu qocanın aristokrat təbəqədən olduğu o saat gözə çarpırdı

.Başına silindir papaq qoymuş, əlində sümükdən düzəldilmiş əsa tutmuşdu

Sürücü tez irəli gəlib qocaya yol göstərdi və əli ilə dükanın üstündəki tabloya işarə .edərək qocanı adresi düz gəldiklərinə əmin etdi

Qoca qabaqda, sürücü də arxasınca təmkinli addımlarla dükana sarı gəlməyə .başladılar

.Onlar dükana daxil oldular

.Mən qapının ağzında dayanmışdım, həyəcanım get-gedə artırdı

Qoca gözünü dolandırıb ətrafı nəzərdən keçirdi, baxışlarını mənim üstümdə saxlayıb ?yaxına gəldi, dedi: Sizin dükanınızdır

.Yox, bir az gözləsəniz dükanın sahibi indilərdə gəlməlidir–

Qocanın səsinin tonundan anladım ki, mənimlə bir az bundan qabaq telefonda danışan şəxsdir. Həmin anda Allaha yalvarırdım ki, qardaşım gəlib bu macəradan xəbər tutmasın. Çünki, qardaşım belə bir iş tutduğumu bilsəydi məni təhqir etmək üçün əlinə .yeni bəhanə düşəcəkdi

Qoca mənim həyəcanlandığımı duyub işin nə yerdə olduğunu anladı. Bunun üçün də :mehribanlıqla soruşdu

Yarım saat bundan qabaq bizim evə zəng edən sən deyildinmi? Səsiniz mənə tanış .gəlir

İstədim üzr istəyib onları narahat etdiyim üçün dil-ağız edim, amma qoca duruxduğumu görüb məsələdən duyuq düşdü. Qarşıya gəlib məni qucaqladı və əlini !astaca kürəyimə vurub dedi: Allaha şükür et ki, Banu xatunun axtardığını tapmışam

Sonra üzünü sürücüsünə tutub acıqlı bir ifadə ilə dedi: Niyə durub tamaşa edirsən? !Ağaya yolu göstər gedək! Özümüzü tez Banu xatuna çatdırmalıyıq

Mən nə qədər getməkdən boyun qaçırırdımsa qoca daha çox israr edirdi. Bu əsnada qardaşım gəlib çıxdı. Bir kənarda durub təəccüblə aristokrat bir qocanın məni qonaq .aparmaq üçün necə israr etdiyinə tamaşa edirdi

Axırı özümü qəzanın hökmünə tapşırıb razılaşdım. Qardaşım məsələdən xəbər .tutmamış tez qoca ilə çıxıb getmək istəyirdim

Heç yadımdan çıxmaz,–maşına oturmaq istəyəndə vücudundan qürur yağan qoca şəxsən qabağa keçib qapını mənim üçün açdı və hörmətlə mənə yer göstərdi. Qardaşımın heç yuxusuna da girməzdi ki, onun tələbə qardaşına belə hörmət göstərsinlər. Xudafizləşəndə əlimdən tutub astaca qulağıma dedi: İndi başa düşdüm bizi niyə saymırmışsan. Ey kaş Allah mənim bütün var-dövlətimi əlimdən alardı, .əvəzində bu qoca kimi karlı aristokrat bir mürid mənə nəsib edərdi

Qardaş, olmaya pul çap edirsən bizim xəbərimiz yoxdur, hə? Nolar, gəl bizim də !qanadımızdan yapış, hər necə olsa da biz qardaşıq axı

Amma deyəsən yaddan çıxarmışdı ki, mənimlə görüşmək istəməyən, mənim ruhani olmağımı bağışlanılmaz günah hesab edən o özü idi. Hətta bu gün pulları dəyişməyə gedəndə acı sözləri ilə yarama duz səpdi, malını, dövlətini üzümə çəkib mənə rişxənd .elədi

Abrımı qoruyan Allah oldu: Məni qardaşımın gözündə o qədər böyütdü ki, qardaşım indi .mənim yerimdə olmağın həsrətini çəkirdi; mənə deyirdi gəl mənə də əl tut

Əgər mən bütün həyatım boyu təkcə həmin unudulmaz anın şükrünü yerinə yetirmək .istəsəm, yəqin ki, yenə də bu haqqı ödəməmiş olaram

.Allah həqiqətən də kərim və çarə edən, biz bəndələr isə nankoruq

Maşın sür`ətlə xiyabanları bir-birinin ardınca şütüyüb keçirdi. Ömrümdə belə bir maşına oturmadığım üçün mənə elə gəlirdi ki, gəmidə oturmuşam və dalğaların qoynunda hərəkət edirəm. Səhərki xırıltı-gurultu ilə gələn avtobus hara, indi getdiyim maşın hara?! Doğrudan da insan Allahın işlərinə heyran qalır, Onun əzəməti qarşısında .özünü bütün vücudu ilə kiçik hiss edir

Maşın Tehranın şimal hissəsinə çatıb villalar olan səmtə üz tutdu. Bir-iki döngəni keçəndən sonra böyük bir bağ evinin qarşısında dayandı. Bağın giriş qapısının

ağzında xüsusi forma geyinmiş iki gözətçi durmuşdu. Maşını görər-görməz tez özlərini yığışdırıb darvazanın taylarını açdılar. Qoca əlinin işarəsi ilə onlara salam verib əsasını astaca sürücünün çiyninə toxundurmaqla, dayanmayıb hərəkət etməsinə göstəriş .verdi

İki tərəfində gül ləkləri olan enli yolla hərəkət edib saraya tərəf üz tutduq. Bağdakı iri gövdəli, hündür ağaclar bağın qədim bir mülk yeri olduğundan xəbər verirdi. Dairəvi .şəkildə olan evin dörd tərəfindən də giriş qapıları var idi

Qapıların hamısından evi əhatə etmiş çəmənli meydana enli pillələr uzanırdı. Evin şimala baxan səmtinin fasadı aşağıdan yuxarı dırmaşmış sarmaşıqla yaşıl örtüyə .bürünmüşdü

Maşından enib evin şimal qapısından içəri daxil olduq. Zala boya-boy döşənmiş qədim xalçalara, tavandan asılmış iri çilçıraqlara, zərbaft tirmələrə, künclərdə yerləşdirilmiş əntiq əşyalara baxanda bir anlığa özümü muzeydə hiss etdim. Birdən-birə belə cah-cəlalı görmək, təbii ki, mənim kimi adamları heyrətləndirməyə bilməzdi. Ürəyimdə dedim, ilahi, insan xisləti niyə bu qədər doyumsuzdur. Niyə insan Allahdan uzaq düşəndə dünya malına daha çox həris olur və axırda da nakam, əliboş o dünyaya köç edir? İnsan yığdığı dövlətdən o biri dünyaya bir şey apara bilirmi? Heç nə aparmamağı ?bir tərəfə, bu qədər dövlətin hesabını necə verir

Yadımdadır, o anda heyrətdən ağzımı açıb söz deyəcək halda deyildim. Arzu edirdim bu tamaşa mümkün qədər tez qurtarsın. Bu elə bir tamaşa idi ki, mən orada ancaq .tamaşaçı rolunu ifa edirdim. Oyunun baş qəhrəmanını isə hələ ki görməmişdim

İntizarım çox çəkmədi. Bir neçə dəqiqədən sonra qoca, xanımı ilə birlikdə pillələrin başında görsəndi. Banu xatun xüsusi xidmətçisinin köməyi ilə başına atdığı çarşabın .yan-yörəsini düzəldədüzəldə çətinliklə pillələri aşağı endi

Tamaşa özünün həssas yerinə çatmışdı. Mən özümü bu tamaşanın son səhnəsini .görməyə hazırlayırdım

Xanım bir-iki addımlığıma çatanda, məni görməyilə qışqırıb özündən getdi. Xidmətçilərdən biri tez qaçıb gülab şərbəti gətirdi, o biri, xanımı yaxındakı kresloya .oturdub əllərini ovuşdurmağa başladı

Bir azdan xanım özünə gəldi, üzünü qocaya tutub dedi: Atamın ruhuna and olsun, bu oğlanı dünən elə bu qiyafədə, bu şəkildə yuxuda mənə göstərmişdilər. Həyatımın !açılmaz düyününü açacaq adam budur

Üzümü qocaya tutub dedim: Bu sirrin üstünü açmağın vaxtı çatmayıbmı? Mənim artıq .səbrim tükəndi

Dedi: Bu xanım mənim həyat yoldaşımdır. Atası adlı-sanlı Qacar nəslindən idi. Keçən il Allahın rəhmətinə gedib ömrünü sizə bağışladı. Ölüm ayağında, tənha övladı olan, gördüyün bu xanıma–mənim yoldaşıma bir

.vəsiyyət etmişdir ki, gərək bunu onun öz dilindən eşidəsən

Banu xatun özünü sakitləşdirməyə sə`y edərək dedi: Atam ömrünün son dəqiqələrində məni otağına çağırıb dedi: Sən mənim yeganə varisimsən və bundan sonra bütün bu mal-dövlət sənə çatacaq. Mən son nəfəslərimdə sənə qoyub getdiyim mirasın qarşısında səndən ancaq bir şey istəyirəm. Mənə söz ver ki, mən öləndən .sonra vəsiyyətimə əməl edəcəksən

.Dedim: Nə xahişiniz olsa yerinə yetirəcəyəm

Atam dedi: Allah mənə uzun ömür verdi, çoxlu sərvət nəsib etdi, amma təəssüflər olsun ki, Allahın mənə nəsib etdiyi bu qədər mal-dövlətdən xalqın yolunda bir şey xərcləyə bilməmişəm. Belə bir niyyətim olsa da, həmişə vaxtın çoxluğuna aldanıb geriyə atmışam. İndi budur, can verdiyim yerdə yadıma düşüb. Dünən oturub fikirləşirdim, gördüm Allahın razılığını cəlb edəcək elə bir əməlim olmayıb. Allaha olan borclarımı bir də nəzərdən keçirdim, baxdım haqq-hesabımın bir hissəsini ödəyib hesabımdan silmişəm, amma qalan hissəsini xəstələndiyimə görə hesabımdan çıxara bilməmişəm. Mənim taxtımın altında bir sandıq var. Mən öləndən sonra onu götürərsən, içindəkiləri ehtiyacı olanların arasında bölüşdürərsən. Hamısı son qəpiyinə qədər yoxsullara paylanmalıdır. Mənim səndən xahişim ancaq budur, başqa heç bir !şey istəmirəm

səh:۱۷۵

Mən atama söz verdim ki, ilk fürsətdə onun vəsiyyətinə əməl edəcəyəm. Amma təəssüflər olsun ki, atamın ölümündən sonra bir müddət başım qarışdı hüzür məclislərinə, evə gəlib-gedənləri qarşılamağa; sonra da bu gün-sabah deyib vəsiyyəti .unutdum

Dünən gecə röyada dəhşətli bir yuxu gördüm. Ürək paralayan bir səhnəni mənə .göstərdilər. Ömrümün axırına kimi o səhnə yadımdan çıxmaz

Yuxuda gördüm atamın hesab-kitabına baxırlar, atam mizan-tərəzi qarşısında durub cavab verməklə məşğuldur. Hey yalvarıb deyirdi ki, mənim təqsirim yoxdur, mən !günahsızam, qızımın səhlənkarlığıdır

Bu vaxt gözü mənə sataşdı. Üstümə qışqırıb dedi: Gördün başıma nə oyun açdın? Məgər mənə söz vermədin ki, ilk fürsətdə vəsiyyətimə əməl edəcəksən? Niyə sandığın ?içindəkiləri sahiblərinə çatdırmadın

Həmin anda arzu edirdim ki, yer yarılsın, yerə girim. Xəcalətimdən atamın gözlərinin .içinə baxa bilmirdim

?Dedim: Bağışla, ata, yadımdan çıxıb. İndi mən nə edim, səhvimi necə düzəldim

:Bu vaxt iki nəfər əzab mə`muru atamı özləri ilə aparmaq istəyirdi ki, atam dedi

Qızım! Bu oğlana diqqətlə bax! Bu ağa sabah səhər düz saat doqquzda kasıbçılığın şiddətindən telefonu götürüb Allahla danışmaq istəyəcək. Allahın lütfü ilə yığdığı nömrə sizin evin nömrəsi olacaq. Gözdə-qulaqda ol, bu fürsəti əldən qaçırma. Həmin sandıq bu oğlana

!çatmalıdır. Qızım! Bu son fürsətdir, məbada onu əldən çıxarasan

Atamın göstərdiyi tərəfə baxanda, gördüm sən həmin bu qiyafədə durub mənə .baxırsan

Hövlanak yuxudan ayıldım. Tez ərimi qaldırıb yuxuda gördüklərimi ona danışdım. Evdəkilər bunun adi bir yuxu olduğunu güman edib məni sakitləşdirməyə çalışırdılar. Amma mənim, yuxuda gördüklərimin həyatda təkrar olacağına zərrə qədər şəkkim yox idi. Səhər açılandan hamımız telefonun dövrəsində oturub saat doqquz tamamı gözləyirdik. Mən əmin idim ki, səni görəcəyəm. Bir az bundan qabaq səni ilk dəfə .görəndə, artıq əmin oldum ki, axtardığımı tapmışam

Bu gün səhər saat doqquzda telefon zəng çaldı. Ərim mənim xahişimlə dəstəyi götürüb sizdən acizanə xahiş etdi ki, danışığı kəsməyəsiniz. Sonrasını da siz daha yaxşı !bilirsiniz nə oldu

Mən sanki uzun bir yuxudan ayılırammış kimi silkinib dərindən nəfəs çəkdim. Boylanıb ətrafı bir də nəzərdən keçirdim, tam oyaq olduğumu yəqin etdim. Həyatımda baş verən bu yenilik o qədər fövqəladə və gözlənilməz oldu ki, inanmağım gəlmirdi. Bir !?insanın həyatı bir neçə saatın ərzində nə qədər dəyişə bilərmiş

Borclarımın əlindən, abır-həyamın qorxusundan ailəmi Qumda, Allahın pənahında qoyub Tehrana üz tutan mən, –miskin bir tələbə–indi elə bir məqamda qərar tutmuşdum ki, Tehranın ən dövlətli, şövkətli

adamlarından biri acizanə şəkildə məndən cəvahirat dolu sandığı qəbul etməyimi xahiş edirdi. Ey dili-qafil, dünyanın işinə bax, bu adamlar sandıqdan xilas olmaq, .pulların öz sahibinə çatması üçün məndən kömək istəyirdilər

Bu işin xəmirini Mehriban Allah keçən gecədən yoğrub hazırlamışdı. Beləliklə, mənim fəqiranə həyatıma son qoymaq üçün bütün səbəblər halqası əl-ələ verərək Allahın .təqdirini mənim barəmdə cari etmişdi

Doğrusu, dünən gecədən məndə hansı əsaslı dəyişiklik baş vermişdi ki, həyatımı da ...?birdən-birə köklü sürətdə alt-üst etdi?! Mən qeyri-adi görünəcək nə etmişdim axı

Ancaq Allaha üz tutmuş, bütün vücudumla Allahı səsləmişdim. Mə`sumə xanıma sınıq qəlblə təvəssül və o biri aləmlə qəlbi bağlılığımı bərqərar etmişdim. Qəlbimin süfrəsini .səmimi şəkildə Allah dərgahında açmış, Ondan kömək istəmişdim

Evin xatununun göstərişi ilə sandığın kilidini gətirdilər. Banu xatun açarı mənə verib sandığın qıfılını açmağı mənim özümə həvalə etdi. Mən iki rəkət namaz qılıb, Allaha mənə göstərdiyi lütfünə görə şükür edəndən sonra sandığın ağzını açdım. Sandığın :içindəkilər bunlardan ibarət idi

.Yüz min tümən nəqd pul .١

.Yüz əlli ədəd qızıl onluq sikkə .٢

.Əlli parça almas və cəvahirat .٣

səh:١٧٨

.Tehranın şimalında, ən səfalı məntəqəsində iyirmi hektar torpağın malikiyyət sənədi .۴

.On doqquz ədəd əntiq və qiymətli əşya .۵

Banu xatunun göstərişi ilə mülkiyyət işlərinə baxan idarənin rəisini evə çağırtdırıb, həmin andaca adı çəkilən torpağın malikiyyətini mənim adıma keçirtdilər. Naharı yeyib bir qədər istirahət etdikdən sonra qocanın sürücüsü ilə birlikdə Quma sarı hərəkət .etdik

.Quma çatanda sürücüyə dedim: Hərəmin yanında maşını saxlayarsan

Hərəmə çatıb maşından endim və birbaşa Mə`sumə xanımın ziyarətinə yollandım. Allah-təalanın dərgahına həmd-səna edəndən sonra həyatımın kor düyününü açmaqda köməkliyinə görə Mə`sumə xanıma öz təşəkkürümü bildirib elə həmin müqəddəs məkanda Allahla əhd-peyman bağladım ki, mənə əta etdiyi bu sərvəti Onun bəyəndiyi yerlərdə sərf edəcəyəm, ehtiyacı olanların əsaslı problemlərinin həllinə xərcləyəcəyəm. Evə çatan kimi gördüyüm ilk iş borc sahiblərinə borclarını qaytarmaq oldu. Borclarımı verəndə elə bil köksümün üstündən ağır bir daş .götürdülər, rahat nəfəs almağa başladım

İkinci gördüyüm iş bu oldu ki, tez gedib özümə xudmani bir ev aldım. Uzun illər kirayələrdə dərbədər dolaşan ailəmi artıq özümə aid olan evə gətirdim. Sabahısı gündən e`tibarən Tehranda və Qumda tanıdığım e`tibarlı və işbilən adamlara ,müraciət edib qızılları

cəvahiratı, torpağı və digər əşyaları satışa çıxartdım. Hamısını günün qiymətinə satıb bankların birində açdığım hesaba qoydum. Biznes işlərində təcrübəsi olan yaxın adamlarım ilə məşvərət edib əldə etdiyim məbləğin yarısını sərmayəyə yatırtdım. Qalan hissəsinə neçə dənə uşaq evi, məktəb, bağça, məscid, klinika, əczaxana tikdirdim, bə`zi ucqar kəndlərin abadlıq işlərinə sərf etdim. Sərmayəyə yatırtdığım pulun gəliri ilə indiyə qədər onlarla yetim, kimsəsiz uşağın inistitutu bitirənə qədər bütün xərclərini öz üzərimə götürmüşəm. İndi şifahi dildə bu pulun bərəkəti ilə gördüyüm işləri dəqiqliyi ilə deyə bilmərəm. Yazdığım kitabda bunların hamısı göstərilib. Arzu edirəm bu kitabı oxuyan xeyirxah insanlar Allah bəndələrinə, onların problemlərinin aradan qaldırılmasında, ehtiyaclarının tə`min edilməsində daha .yaxından kömək etsinlər

Kişi bunu deyib sözünü bitirdi. Bu müddət ərzində heyranlıqla onun sözlərini dinləyib ayağa qalxıb kişinin mehriban əllərindən öpdüm. Tez kitabın çap icazəsini imzalayıb .ondan xahiş etdim ki, “Hikmət” nəşriyyatına qədər mənimlə gəlsin

Onu “Hikmət” nəşriyyatının müdiri seyyid Yəhya Baqiri ilə tanış edib, şair və ədib olan bu dostumdan xahiş etdim ki, növbəsi nəzərə alınmadan kişinin kitabını çap etsin. Dedim, bəlkə bu kiçik köməkliyimizlə bizim də Allahın bəyəndiyi bu işdə bir payımız .oldu

səh:۱۸۰

Bu gün bu xatirəni sizə yazdığım bir vaxtda mənim həmin xeyirxah ruhani ilə tanışlığımdan təqribən otuz doqquz il keçir. Neçə illərdir ki, ondan xəbərsizəm. Əgər Allahın rəhmətinə getmiş olsa, Allah-təaladan axirətdə onu ali dərəcəyə çatdırmasını arzu edirəm, əgər həyatdadırsa, səmimi qəlbdən ona xeyir-dua göndərir və deyirəm: (İlahi, onu harada olsa salamat et!(١)

### TƏVƏSSÜLÜN NƏTİCƏSİ

Bəhlulun ömür səhifəsini vərəqləyərkən hər səhifəsində bir ibrət, bir hikmət görürsən. .Yetər ki, ibrət götürən olsun

:Yenə də acılı-şirinli zindan xatirələrindən birini Bəhlulun öz dilindən eşidək

Əfqanıstanda məni ilk dəfə həbsxanada tək nəfərlik kameraya salanda qaldığım yer taxtabiti ilə dolu idi. Balaca, qırmızı rəngə çalan bu həşarat canımı boğazıma yığmışdı. Sancdığı yer qızarıb qabar atır, bir saat acışma verib şiddətli qaşınmağa başlayırdı. Bu cücünün olduqca pis qoxusu olurdu. Xüsusilə də gecələr hücuma keçir, səhərə qədər mənə divan tuturdular. Düz üç gecə bu həşaratların əlindən yata bilmədim. Üçüncü .gün səhərə yaxın Allahla münacat edib məni bu bəladan qurtarmasını istədim



---

.Mücahidi Məhəmmədəli, “Dər məhzəre lahutiyan”, c. ٢, səh. ٢٥٧ [٨۴] -١

Ağlayıb deyirdim: İlahi! Mən din yolunda hər cür məşəqqətlərə qatlaşmağa razıyam. Amma bilim ki, bu zəhmətlərimin dinə bir faydası olacaq. Əgər bu həşaratların məni sancmasının dinə bir xeyri varsa, mən heç bir söz demirəm, səbir edərəm. Amma bu ağrı-acılara dözməyimin dinə heç bir faydası olmadığı üçün, Səni and verirəm Həzrət Məhəmməd (s) və onun pak ailəsinin izzətinə–bu bəlanı öz bəndənin üstündən götür!

Bu cür minacat edib Allahla dərdləşirdim. Məni nə vaxt yuxu apardığını bilmirəm...... Ayılanda gördüm gün qalxıb. Qəribə də olsa bədənimin heç bir yerində nə qaşınma hiss etdim, nə də bir qızartı gördüm.

Gözlərimi ovuşdurub tam ayılanda bir də gördüm–İlahi!... Bu nədir?–Hücrəni başdan-başa balaca qarışqalar başına götürüb; o qədər qarışqa dolub ki, otağın ağ divarları qarışqa əlindən qara görsənir. Elə bil divarları qara örtüklə örtmüşdülər. Qarışqalar nə ki taxtabiti var, hamısını tutub öldürürdülər. Hətta yarıqların diibndə, həsirlərin, stol-stulun arasında olan taxtabiti yumurtalarını tapıb məhv edirdilər. Küncdə-bucaqda elə bir yer yox idi ki, qarışqalar oranı zəbt etməmiş olsunlar. Günorta çağı artıq nə taxtabitidən xəbər var idi, nə də qarışqadan. Sanki hər yer dizinfeksiya olunub təmizlənmişdi.(١)



---

١- [٨٥] Seyyid Abbas Musəvi Mütləq, “U`cubeyi-əsr”, səh. ٨٢, ٨٣.

İyirmi ildən artıq Ayətullah Şeyx Məhəmməd Fazil Lənkəraninin mühafizəçisi olmuş cənab Ümidi belə nəql edir: Bir gün həddən artıq narahat idim. Maddi vəziyyətin ağırlığı və qarşıya çıxan bir sıra problemlər məni məngənə kimi sıxırdı. Həmin gün çox çalışsam da pərişanlığımı ağadan gizlədə bilmədim. Ayətullah Fazil bunun səbəbini soruşdu. Cavabdan yayınmaq istədim. Amma ağanın cavab gözləyən mə’nalı baxışları məni danışmağa vadar etdi. Əhvalatı olduğu kimi söylədim. Ağa təmkinlə qulaq asıb məni dua etdi, Allah-təaladan müşküllərimin tezliklə həll olunmasını dilədi. Daha sonra təsəlli üçün öz başına gəlmiş bir hadisəni xatırladı və dərindən ah çəkib söhbətə :başladı

Şah rejimi dövründə mübariz inqilabçılara, alim və ruhanilərə yönəlmiş amansız rəftarlardan bizə də bir pay düşmüşdü. Məni İran körfəzi rayonlarından biri olan Lingə limanına sürgün etmişdilər. Bu məntəqədə qışın orta aylarında belə istidən və rütubətdən nəfəs almaq olmur. Səhhətimə münasib olmayan bu ab-həva onsuz da zəif və xəstə cismimi taqətdən salmışdı. Yerləşdiyim daxmanın yaxınlığında kiçik bir çayxana vardı. Orada mö’min bir kişi işləyirdi. Səhər, günorta və axşam yemək üçün oraya gedirdim. Həmin mö’min kişi bu sadə və kiçik yerdə mənə xüsusi qayğı göstərməyə çalışırdı. Bir gün səhər yeməyi üçün yenə çayxanaya getmək istədim. Əlimi cibimə saldım. Cibimdə bir tümən də olsun pul

qalmamışdı. Qayıdıb oturdum. Günorta və axşam da beləcə sovuşdu. Səhəri gün sübh namazından sonra bir tərəfdən havanın ağırlığı, bir tərəfdən xəstəlik və aclığın tə’sirindən halım pisləşdi. Üzüqibləyə oturub Allahla raz-niyaza məşğul oldum. Əllərimi İlahi dərgaha açıb belə ərz etdim: «İlahi, vücudumun Sənin dininə xeyri varsa, məni bəndələrin yanında xar etmə, ruzi yetir acından ölməyim. Yox, əgər həyatımın Sənin dininə bir faydası yoxdursa, canımı al. Mən kimsəyə əl açmayacaq, kimsədən borc və ya yardım istəməyəcəyəm.» Allaha təvəkkül edib gözləməyə başladım; həmin günü bir təhər yola saldım. Səhəri gün günortadan sonra təmiz hava almaq üçün körfəzin kənarında əyləşib mavi sulara tamaşa edirdim. Bu vaxt yaşlı bir kişinin sür’ətlə mənə tərəf gəldiyini gördüm. Əvvəlcə onun nəsə istəyəcəyini güman etdim. Özüm möhtac ikən ona nə verə bilərdim?! Xəcalət hissi keçirdim. Nəhayət, həmin şəxs əlində bir bağlama tövşüyə-tövşüyə yaxınlaşıb soruşdu: «Ağa Fazil sizsiniz?» Cavab verdim: «Bəli.» «Bu əmanət sizə çatacaq» – deyə əlindəki bağlamanı mənə tərəf uzatdı. Bağlamanı almayıb onun nə olduğunu soruşdum. Cavab verdi: «Mən bir il idi ki, həccə getməyə hazırlaşırdım. Özüm də balıqçıyam, kiçik bir gəmim var. Səfərə çıxmaq üçün nə lazım idisə tədarük görmüşdüm. Pasport, viza və yol xərcini hazırlamışdım. Bu gün səhər yola düşməli idim. Axşam qəribə bir yuxu gördüm. Həzrət Peyğəmbər (s) yuxuda səfəri tə’xirə salmağımı əmr edib buyurdu ki, həcc üçün topladığım pulu sizə verim. O həzrət buyurdu

ki, sənə həccin savabı yazıldı və o pulları ağa Fazilə çatdır. Bu gün səhərdən sizi axtarıram. Çayçı kişi sizin sahildə olduğunuzu deyən kimi bir başa buraya gəlib sizi tapdım. Şükürlər olsun ki, həzrət Peyğəmbərin (s) əmrini yerinə yetirdim!))

səh:۱۸۵

**Mündəricat**

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ٩

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ٢٠٠۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.١

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.٢ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .٣ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.١

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹